DOI: https://doi.org/10.36719/2706-6185/06/5-8

**Südabə Nəsrəddin qızı İsgəndərova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
pedaqoji elmlər üzrə fəlsəfə doktoru
sudaba.isgandarova@adpu.edu.az

# AUTİZM SPEKTR POZULMASI (ASP) OLAN UŞAQLARIN TƏLİMİNDƏ İSTİFADƏ EDİLƏN METOD VƏ YANAŞMALAR

**Xülasə**

Erkən yaşdan həyata keçirilən vestibulyar reabilitasiya ASD olan uşaqların inkişafında və təhsilində mühüm rol oynayır. ASP-nin tədrisində oyun mühüm rol oynayır. Burada terapiya metodundan geniş istifadə olunur. Bu, sosial davranışa nail olmaq üçün ünsiyyət bacarıqlarını, uyğunlaşdırılmış davranışı, öyrənmə bacarıqlarını inkişaf etdirən düzəldici vasitələr sistemidir. Terapiya xüsusi proqrama uyğun olaraq evdə fərdi şəkildə aparılır. Terapiya metodunun düzgün formalaşdırılması ilə əqli, əxlaqi, zəhmətkeş, estetik tərbiyənin digər növlərinin həyata keçirilməsi effektiv nəticə hesab olunur.

***Açar sözlər***: *autizm spektr poozulması, təlim, metod, terapiya, bacarıqlar*

**Sudaba Nasraddin Isgenderova**
Azerbaijan State Pedagogical University
Doctor of philosophy in pedagogical sciences
sudaba.isgandarova@adpu.edu.az

## Methods and approaches used in teaching children with autism spectrum disorder (ASP)

**Abstract**

Vestibular rehabilitation, carried out from an early age, plays an important role in the development and education of children with ASD. In teaching ASP an important role is played by the game. The method of therapy is widely used here. It is a system of corrective tools that develop communication skills, adapted behavior, learning skills in order to help achieve social behavior. The therapy is carried out individually at home according to a special program. With the correct formulation of the method of therapy, the implementation of other types of education and training, mental, moral, laborious, aesthetic, is considered an effective result.

***Keywords:*** *autism spectrum disorder, training, methods, therapy, skills*

## Giriş

Metodik baxımdan ABŞ, Yaponiya və Qərbi Avropa ölkələrində ASP olan uşaqların korreksiyasına yanaşmalar olduqca müxtəlifdir. Belə ki, Böyük Britaniya Milli Autizm Cəmiyyətinin (National autistic society, NAS) "autizmin korreksiyasına yanaşmalar" adlı məlumat kitabçası (1995) yetmişdən artıq maddəni əhatə edir, baxmayaraq ki, praktiki əhəmiyyət daşıyan yalnız 5-6 metod vardır və ilk növbədə operant təlim (biheviorial psixologiya əsasında) və TEASSN proqramı istifadə edilir.

Rusiya Təhsil Akademiyasının (RAO) Korreksiya Pedaqoji İnstitutuna görə, vaxtında düzgün korreksia işləri aparıldıqda, ASP olan uşaqların 60% -i kütləvi məktəbin tədris planına, 30% -i xüsusi məktəbin proqramına əsasən təhsil almaq imkanı əldə edir. 10% isə uşaqlar ailədə adaptasiya olunur. Korreksiya aparılmadığı hallarda isə 75% -i ümumiyyətlə sosial cəhətdən uyğunlaşmır, 22-23% -i nisbətən uyğunlaşır (daimi qayğıya ehtiyac duyur) və yalnız 2-3% -i qənaətbəxş bir sosial uyğunlaşma səviyyəsinə çatır.

Türkiyədə ASP olan uşaqlar üçün məcburi təhsil, əsasən, 36 aydan başlayır: evdə təhsil, stasionar şətaitdə təlim xidməti, 0-36 aylıq ASP olan uşaqlar üçün Erkən Uşaqlıq Dövrü Təlim

Xidməti, ASP olan uşaqlar üçün 12 həftəlik təhsil, Xalq Təhsili Mərkəzləri tərəfindən qeyri-rəsmi təhsil xidməti (peşə, texniki, sosial və ya mədəni bacarıqların formalaşdırılması üçün). Bütün təhsil mərhələlərində ASP olan uşaqların inteqrasiya və inklüziyası paralel olaraq aparılır və buna da mütəxəssislər qərar verir. Dəyərləndirmədən sonra ən az məhdudlaşdırıcı mühit prinsipinə görə ASP olan uşaq üçün mühit hazırlanır və sonra ümumtəhsil məktəblərinə daxil olunur. Ən az məhdudlaşdırıcı mühit hər bir ASP olan uşaq üçün fərqlidir. Bu xüsusi sinif və ya ümumitəhsil məktəblərinin siniflləri ola bilir. Əlilliyi 20% və daha çox olan uşaqlar üçün (GOZGER RAPORUNDA) Uşaqlar üçün Xüsusi Ehtiyaclar Hesabatı xüsusi təhsilə ehtiyacı olduğu qeyd edilirsə, (RAM-da) Məsləhət və Tədqiqat Mərkəzlərində təlim bacarıqlarının dəyərləndirilməsi və diaqnozlaşdırılması aparıldıqdan sonra xüsusi məktəblərdə və ya reabilitasiya mərkəzlərində yardımçı təhsil alması üçün hasabat verilir. Bu xidmət təhsil nazirliyi tərəfindən təsdiq olunmuş dəstək təlim proqramlarına uyğun olaraq ayda ən çox 8 saat və ya 4 saat qrup və fərdi təlim şəklində həyata keçirilir. İnklüziv və ya inteqrativ məktəblərdə dəstək və ya yardımçı otaqlar olur, məktəbəqədər ASP olan uşaqlar üçün fərdi inkişafı təmin edən qurum fəaliyət göstərir və həftəlik ümumi dərs saatının 40% ni burada keçə bilərlər. Xüsusi təhsil məktəblərində həftədə 2 saat olmaqla tamamlayıcı təlim fəaliyyəti həyata keçirilir. İnklüziv və inteqrativ siniflərdə sinif daxilində və sinifdən xaricdə akademik, sosial və özünə xidmət bacarıqlarını həyata keçirmələri məqsədi ilə köməkçi şəxs təyin edilir. İnklüziv məktəblərdə ASP olan uşağın imkanlarını nəzərə alaraq imtahan suallarının hazırlanması və göndərilməsi RAM tərəfindən həyata keçirilir. Əgər universitetə imtahan vermək istəyirlərsə, əlavə vaxt, mətnin oxunması, işarələmə ilə bağlı ÖSYM-ə (Ölçmə, Seçmə, Yerləşdirmə və Mərkəzi – imtahan mərkəzi) müraciət edə bilərlər (Olcay, 2020).

Aparılan işlərə baxmayaraq ASP olan uşaqlarla işləyərkən aşağıdakı problemlərlə qarşılaşmaq olar:

1. Təlim almasına baxmayaraq hələ də ASP olan uşaq danışmırsa ya loqopedə müraciət olunur, ya da alternativ və dəstəkləyici xidmət olan toxunma ekranlı danışma cihazlarından və ya proqramdan (məsələn, Touch to Talk) pulsuz istifadə edə olunur (2).
2. Akupunktur, pəhriz, qidadan ağır metalların çıxarılması və heyvan terapiyaları kimi tətbiqlərdən faydalanmaq söylənir, lakin bunların ASP olan uşaqlara o qədər də müsbət təsiri görülməməkdədir.
3. ASP olan uşaqlarda bioloji səbəbli ( allergiya zamanı qaşınma), psixoloji (tik) və davranış (diqqət çəkmək üçün) səbəbi ilə davranış problemləri ola bilər. Yalnız davranış səbəbiylə davranış problemi “Diferensial möhkəmləndirmə”, “Söndürmə”, “Cavabı kəsmək” və “Yönləndirmək” kimi müxtəlif davranış azaldılması texnikalardan istifadə olunur.
4. ASP diaqnozu qoyulmuş uşaqların ailələri və müəllimləri üçün hazırlanmış, müxtəlif əyani və videolarla dəstəklənən və pulsuz təlim verən platformalar mövcuddur (3).

Autizmdə beyin pozulmasının struktur səbəbləri araşdırılmışdır. Struktur səbəbləri arasında vestibulyar sistem də böyük rol oynayır. Vestibulyar sistemin inkişafını təmin edən üsullardan biri sensor inkişafdır. Sensor inkişaf sayəsində ASP olan uşaqların mənimsəmə qabiliyyəti artır. Odur ki, ASP olan uşaqların təlim-tərbiyəsi ilə bərabər 3-10 yaş arası vestibulyar reabilitasiya işi aparılır (Copkhes, 2013).

ASP olan uşaqların təlimində oyun fəaliyəti də böyük rol oynayır. Oyun yaş imkanların uyğun rutinlərlə həyata keçirilir. Hər bir oyun rutini fəaliyyətin başlanğıcı, davamı və sonundan ibarətdir (Libling, 2016).

ASP olan uşaqlarda aşagıdakı modullar üzrə bacarıqlar formalaşdırılır: eyniləşdirmə, təqlid, təlimatları yerinə yetirmə bacarıqları,vizual dəstəkdən istifadə, nitqi qavrama bacarıqları, ekspressiv nitq bacarıqları, oyun və musiqi bacarıqları, özünəqulluq, gündəlik məişət vərdişləri, motor bacarıqlar, sosial bacarıqlar, oxuma-yazma, riyaziyyat bacarıqları modulu. Müxtəlif bacarıqların formalaşdırılmasında müxtəlif metodlardan istifadə olunur. Məsələn, riyaziyyat bacarıqlarının formalaşdırılması zamanı Pilləli təlim metodundan geniş istifadə olunur (Special training and rehabilitation center support training program for common developmental disorders, 2008).

Birbaşa anlatma metodu 2 amil nəzərə alınmalıdır:

1) əsas və əlavə xüsusiyyətlər (məsələn, üçbucağın 3 tərəfi və 3 bucağı-əsas xüsusiyyət; böyük, kiçik, fərqli materialda üçbucaq - əlavə xüsusiyyət)

2) əlaqəli və əlaqəsiz nümunələr (məsələn, "plastik", "taxta üçbucaq" və s. uyğun; "plastik kvadrat", "taxta dairə" və s. isə uyğun olmayan nümunədir).

Ən geniş tətbiq olunan üsullardan biri də Tədbiqi Davranış Analizi terapiyasıdır (ABA). Tədbiqi Davranış Analizi terapiyası sosial əhəmiyyətli davranışları dəyişdirməyi öyrənən emprik texnikalar haqqında elm sahəsidir və ya yanaşmadır. ABA terapiya ətraf mühit faktorlarının autistik davranışa təsirini müəyyənləşdirməyə, bu amillərin təsirini nəzarətdə saxlamağa, onu dəyişdirməyə imkan verən texnologiya və tədris metodlarına arxalanır. ABA terapiya ünsiyyət bacarıqlarının, adaptiv davranışların, öyrənmə qabiliyyətlərini inkişaf etdirən, müvafiq sosial davranışa nail olmaqda uşağa yardım edən korreksiyaedici vasitələr sistemidir. Terapiya fərdi şəkildə aparılır və evdə deyilən proqram əsasında davam etdirilir. Proses gündəlik olaraq qeydə alınır. Hər gün üçün müxtəlif təkrarlar və yeni bacarıqlar öyrənilməsi qrafiki müəyyənləşdirilir (Galyant, 2019: 6).

ABA terapiyanın mərhələləri bunlardır:

- DTT (Diskret Sınaq təlimi): Bu zaman uşaq müəyyən bacarıqlar qazandığını öyrənə bilir. Bu terapiya addım-addım öyrənməyə əsaslanır və intensiv öyrənmə mərhələsi adlanır. Bu terapiya zamanı öyrənmə daha yüksək səviyyədə olur, çünki təkrarlar nəticəsində fəaliyyətlər daha yaxşı mənimsənilir. Bir uşaq bir hərəkəti dəfələrlə təkrar edir (hətta 5 və daha çox). Bu təkrarlanma bacarıq qazanmaq istəyən uşaqlar üçün xüsusilə vacibdir. Spesifik davranışlara (göz kontaktı, diqqəti cəmləmə və üz ifadələrinin öyrənilməsi) aiddir.
- NET- (Təbii şəraitdə öyrənmə): Bir uşağın öyrəndiyi bacarıqların real şəraitdə mənalandırmasıdır. Buraya uşağın təbii şəraitdə istfadə edə biləcəyi bacarıqlar daxildir. Bu üsul uşağa öyrəndiyi bacarıqları həyatın müxtəlif situasiyalarına tədbiq etməsinə və kömək edir.
- VB-(Sözlü davranış öyrənməsi): Bir qədər diskret sınaq təliminə bənzəyir, bu da strukturlaşdırılmış və addım-addım öyrənmə əsasında formalaşdırılır. Dili öyrənməyə həvəsləndirməklə, öyrənilən söz və onun mənası arasında əlaqə qurulur. Bəzi uşaqların hər hansı bir sözü və ya birləşməni mənimsəməsi üçün ona diqqət yetirmələri lazım olur. Məsələn: Bu nədir? Stəkan. Stəkan nə üçün istifadə olunur? Su içmək üçün. Suyu başqa nə ilə içirlər? Stəkanla.
- FBA- (Çalışmalı Davranış Analizi) Bu zaman qazanılan bacarıqların davranışda əks olunması ilə nəticələnir.

Diskret tədris metodu Lovaas metodu olaraq da bilinir. (Discrete Trial Teaching) ard-arda verilən sual və ya təlimatlarla yeni bacarıqların öyrədilməsidir. Diskret tədris metodu ilə öyrədilən bacarıqlarda uşağa bir sual və ya təlimat verilərək uşaqdan doğru reaksiya tələb olunur. Əgər uşaq doğru reaksiya verərsə mükafatlandırılar, reaksiya verməz və ya səhv reaksiya verərsə səhvi düzəldilər. Bu metod ilə autizm sindromlu uşaqlara bir çox bacarıq qazandırmaq mümkündür.

Replikalı Tədris Metodu: ifadəedici dilə sahib olan, lakin ünsiyyətə daxil olmayan Autizm Spektr Pozuntulu şəxslər bu metod vasitəsi ilə yazılı və ya səsli replikalarla ünsiyyətə başlamağı və davam etdirməyi öyrənirlər (Vasyagina, 2018: 30).

## Nəticə

Bundan başqa ASP olan uşaqlarla təlim zamanı oyun, nağıl, zooterapiya, qum terapiyası, art terapiya, rollu oyun, dram, kompyüter vasitəsi ilə təlim metodlarından istifadə olunur. Uşaqlar oyun zamanı aşağdakı keyfiyyətləri mənimsəyirlər: məsuliyyət hissi, əməkdaşlıq qurmaq, müxtəlif rollar (həkim, müəllim vəs.); paylaşmaq, ailə üzvləri ilə və digər insanlarla daha yaxşı əlaqə qurmaq və s. Zooterapiya zamanı aqressivliyin aradan qalxması, pozitiv əhval-ruhiyyəyənin yaranması, qum terapiyası duyğulara sakitləşdirici və motorikaya aktivləşdirici təsir göstərir. Art terapiya zamanı diqqət əskikliyi azalır, hadisələrə alternativ yanaşma tərzləri formalaşır, təşviş-həyəcan pozuntusu ilə bağlı problemlər aradan qalxır, koqnitiv və hissi-motor funksiyaları inkişaf edir, özünəqiymətləndirmənin, sosial bacarıqların artırılması, stress vəziyyətinin azaldılmasına səbəb olur.

## Ədəbiyyat

1. Olcay, S. (2020). Individuals with autism spectrum disorder. "A guidebook for families". General Directorate of Private Education and Guidance Services.
2. https://www.dktd.org/tr/news.html
3. Tohumotizmportali.org and https://afirm.fpg.unc.edu.
4. Copkhes, Ü. (2013). Impact of Vestibular Rehabilitation in Autistic Children. Istanbul.
5. Libling, M. (2016). Game in the correction of children's autism. Defectology. № 6.
6. Special training and rehabilitation center support training program for common developmental disorders. (2008) Ankara.
7. Galyant, I. (2019). Correction of children's autism by means of art pedagogy. Scientific and methodological assessment of the quality of education. №1 (6).
8. Vasyagina, N. and others. (2018). Psychological and pedagogical aspects of rehabilitation of children with autism spectrum disorders in the conditions of preschool education. National Psychological Journal №2 (30).

Göndərildi: 01.10.2021 Qəbul edildi: 07.12.2021

DOI: https://doi.org/10.36719/2706-6185/06/9-15

**Elcan Elman oğlu Həsənli**
Bakı Dövlət Universiteti
magistrant
elcan.94.eh@gmail.com

# İDMANLA ƏLAQƏLİ MÜBAHİSƏLƏRİNİN ANLAYIŞI, MAHİYYƏTİ VƏ HƏLLİNİN HÜQUQİ ÜSULLARI

**Xülasə**

İdman dövrümüzdə getdikcə daha vacib və peşəkarlaşan bir sahəyə çevrilib. Tarixi prosesdə peşəkar və həvəskar idmançıların, eləcə də idman təşkilatlarının sayının artması milli və beynəlxalq yarışların sayının artmasına səbəb olmuşdur. Bu inkişafla paralel olaraq idmanla bağlı konfliktlər də artıb və bu münaqişələr idmanın öz orqanizminə uyğun həllini tapmalıdır. Doğrudan da, xüsusilə beynəlxalq yarışlarda yaranan mübahisələrin tez bir zamanda həlli yarışların taleyinə təsir edəcək. Lakin bu sahədə fəaliyyət göstərən bir çox təşkilatın mövcudluğu və onların qərarları ilə təcrübələri arasında ortaya çıxan uyğunsuzluqlar bu sahədə vahidliyə ehtiyacı daha da artırdı. Bu ehtiyacı ödəmək üçün məhkəmə orqanı olaraq CAS bu işi öz üzərinə götürdü. CAS digər alternativ mübahisələrin həlli üsullarına qapısını bağlamasa da, xüsusilə arbitraj təmin etdiyi üstünlüklərlə ön plana çıxdı. CAS indiyədək qəbul etdiyi qərarlarla idman hüququndan irəli gələn mübahisələri tez və ədalətli şəkildə həll etmək vəzifəsini yerinə yetirmişdir.

***Açar sözlər:*** *İdman hüququ, idmanla əlaqəli mübahisələr, vasitəçilik, idman arbitraj məhkəməsi, CAS*

**Eljan Elman Hasanli**
Baku State University
master student
elcan.94.eh@gmail.com

## Understanding, significance and legal methods of solution of disputes related to sports

**Abstract**

Sports has become an increasingly important and professionalized sector in our age. The increase in the number of professional and amateur athletes as well as sports organizations in the historical process has brought about an increase in the number of national and international competitions. Parallel to this development, conflicts related to sports have also increased and these conflicts have to be resolved in accordance with the sport's own body. Indeed, settling the disputes that arise especially in international competitions as soon as possible will affect the fate of the competitions. However, the existence of many organizations operating in this field and the inconsistencies that emerged between their decisions and practices increased the need for uniformity in this area. As a judicial authority to meet this need, CAS has undertaken this job. Although the CAS has not closed its door to other alternative dispute resolution methods, it has come to the fore especially with the advantages it provides arbitration. CAS has fulfilled its duty to settle the disputes arising from sports law in a swift and fair manner with the decisions it has made so far.

***Keywords:*** *Sports law, sports-related disputes, mediation, sports arbitration, CAS*

## Giriş

İdman bəşəriyyət tarixi ilə inkişaf etmiş və əsasən fiziki fəaliyyətləri əhatə edən fəaliyyətlərdən biri olmuşdur. Artan idman surəti, "İdman Hüququ" adı altında yeni bir hüquq sahəsinin meydana gəlməsinə də kömək etmişdir. İdman hüququ həm mülki hüquq, həm də inzibati hüquq ilə bağlı

məsələləri özündə birləşdirdiyi üçün qarışıq bir hüquq sahəsidir. İdman əvvəllər insanların həyatda qalmaq üçün gündəlik həyatlarında etməli olduqları hərəkətlər idisə daha sonra, xüsusən də 18-ci əsrdə insanların asudə vaxtlarını keçirtdikləri bir fəaliyyət növünə çevrildi.

İdman 20-ci əsrin əvvələrindən sonra boş vaxtdan səmərəli istifadə, əyləncə məqsədi ilə edilən, sağlam həyat, bədən və zehni qabiliyyətlərin inkişaf etdirilməsi, stresdən azad olma, insan münasibətlərinin inkişaf etdirilməsi, fərdi və sosial iqtisadiyyata töhfə vermək, milli və beynəlxalq təbliğat, təşviqat kimi fərdi və sosial funksiyaları olan fiziki və zehni fəaliyyət halına gəldi.

Azərbaycan Respublikasının "Bədən tərbiyəsi və idman haqqında" qanunun 1-ci maddəsində bədən tərbiyəsinə anlayış verilir və qeyd edilir ki, bədən tərbiyəsi – cəmiyyətin ümumi mədəniyyətinin ayrılmaz hissəsi olmaqla, fiziki hərəkətlər vasitəsilə insanın sağlam həyat tərzinin formalaşdırılmasına, fiziki və əqli inkişafına yönəldilmiş norma, bilik və dəyərlər məcmusunu özündə əks etdirən sosial fəaliyyət sahəsidir. Həmin maddə də idmana da xüsusi anlayış verilir. İdman – müxtəlif fiziki hərəkətlər kompleksi vasitəsilə mütəmadi olaraq şəxsin fiziki hazırlığının təkmilləşdirilməsinə, bütün səviyyəli yarışlarda iştiraka və yüksək nəticələr göstərilməsinə yönəldilmiş bədən tərbiyəsinin tərkib hissəsidir.

İdmanın inkişafına paralel olaraq yaranan idman növlərinin hər biri üçün fərqli qaydalar müəyyənləşdirilirdi. Çünki idmanın fərdlər və cəmiyyətlər arasında yuxarıda göstərilən məqsəd və funksiyaları yerinə yetirmək və lazım olduqda motivasiya və rəqabət elementinə çevrilməsi üçün müəyyən qaydaların və müəyyən standartların vaxtında müəyyən edilməsi vacib idi. İdmandakı qaydalardan bəhs olunduğu bu nöqtədə idmanla hüquq arasındakı əlaqə başlayır. Gündəlik həyatın məcburi bir elementi olan və bugün nəhəng bir sektora çevrilən idmanda yarana biləcək mübahisələri, ixtilafları öz xüsusiyyətləri və qaydaları ilə həll edən, sistematik şəkildə araşdıran bir hüquq intizamını olan "İdman Hüququ" meydana gəlir.

İdman hüququ ilə bağlı bir çox tərif verilmişdir, lakin əhatə dairəsinə görə İdman hüququnun tam tərifini vermək çətindir. İdman hüququ adı verilən hüquq intizamını yalnız inzibati hüquqa və ya yalnız mülki hüquqa uyğunlaşdırmaq mümkün deyil. Həm mülki, həm də inzibati hüquq elementlərini özündə birləşdirən idman hüququ çoxsahəli bir sahədir.

İdmanla əlaqəli mülki və inzibati hüquqa adi mübahisələrdən əlavə mülki və inzibati hüquqa daxil olmayan və idmana xas xüsusiyyətləri özündə ehtiva edən mübahisələr də mövcuddur. İdman hüququ müstəqil bir sahə olduğundan idmanla əlaqəli mübahisələrin də idman hüququ çərçivəsində öyrənilməsi vacibdir. Bu başlıq daxilində öyrəniləcək mübahisələr mülki və inzibati hüquq mahiyyəti daşıya biləcəyi kimi sui generis mahiyətidə daşıya bilər (Eriner, 2010: 65).

İdmanla əlaqəli mübahisələr və ixtilaflar idmanın inzibati quruluşundan, idarəedilməsindən, nizam-intizamından və həvəskar və ya peşəkar idmanla əlaqəli müxtəlif müqavilələrdən irəli gələ bilər. İdman mübahisələrini ümumiyyətlə on başlıq altında qruplaşdırıla bilərik: (Ekşi, 2015: 696)

1. Federasiya və klubların müvafiq orqanlarının və rəhbərlərinin seçilməsi; İdarəetmə, nizamnamə və əsasnamələrin hazırlanması və dəyişdirilməsi kimi idmanın idarə olunması ilə əlaqəli mübahisələr,
2. Oyun qaydaları ilə əlaqəli mübahisələr,
3. İntizam mübahisələri,
4. İdmanla əlaqəli müqavilələrdən irəli gələn mübahisələr,
5. Dopinqlə əlaqəli mübahisələr,
6. İdmanla bağlı cinayət xarakterli mübahisələr,
7. Vergidən yaranan mübahisələr,
8. İdman təşkilatlarının emblemləri, lisenziyaları, markaları, loqotipləri və s. əqli mülkiyyət hüquqlarından irəli gələn mübahisələr,
9. İdman klubları tərəfindən qurulan şirkətlərlə bağlı mübahisələr,
10. İdman fəaliyyətinin səbəb olduğu səs-küy və çirklənmədən irəli gələn ekoloji hüquq mübahisələri.

İdmanla əlaqəli mübahisələr anlayışı doktrinada geniş şəkildə şərh olunur və idman fəaliyyətinin həyata keçirilməsi ilə əlaqədar yaranan bütün mübahisələr idmanla əlaqəli mübahisələr kimi müəyyən edilir.

Dissertasiya işində vergi, cinayət və ekoloji xarakterli idmanla əlaqəli mübahisələrə toxunulmayacaqdır.

İdmanla əlaqəli bəzi mübahisələr mülki hüquqa bəziləri isə inzibati hüquq sahəsinə aid ola bilər. Məsələn klub, idmançı, baş məşqçi, vasitəçilər kimi idmanla bağlı şəxslərin öz aralarında imzaladıqları transfer və idmanla əlaqəli müqavilələrdən yaranan mübahisələr mülki hüquqa xarakterikdir. Bundan başqa idmançıların, klubların və federasiyaların vergi ödəyib ödəməyəcəkləri isə inzibati hüquqa xarakterikdir. Dopinqdən istifadə isə idman intizam qaydalarının pozulmasıdır. Bu hərəkətin intizam cəzasına səbəb olub olmayacağı mülki hüquqa, buna qarşı idmançıya dopinq maddəsi verərək onun ölümünə səbəb olan məşqçi haqqında cinayət işi açılıb açılmayacağı isə cinayət hüququna aid məsələdir.

Hər bir idman növündə o idmanın oynanılması üçün xarakterik olan oyun qaydaları vardır. Oyun qaydaları olaraq adlandırılan bu qaydaların icra edilməsində də mübahisələr yarana bilir. Ümumilikdə idman yarışında hazır vəziyyətdə olan hakim və ya oyunun inspektırı tərəfindən oyun qaydalarının pozulması barədə qərar verilir və müvafiq cəzalar tətbiq olunur. Məsələn, futbol oyunlarından öncə hakimlər tərəfindən futbol meydançasının yoxlanılması, komandaların formalarının və oyunçuların qeydiyyatının yoxlanılması, oyunun başlanılması, oyunun daxilində meydana gələn bir hadisədə hansı tərəfin haqlı olduğuna və bu hadisə ilə bağlı hansı qərarın verilməsi oyun qaydaları ilə bağlı münasibətlərdir.

Oyun qaydaları ilə bağlı verilmiş qərarlara etiraz və şikayət edilə bilməz. Məsələn, futbol oyunu zamanı futbolçuya sarı və ya qırmızı vərəqə göstərilməsi ilə bağlı bu son qərardır və mübahisə edilə bilməz. Milli və beynəlxalq federasiyaların nizamnamə və təlimatlarında bu cür qərarlara qarşı şikayət və arbitraj yoluna müraciət edilə bilməməsi ilə bağlı müddəalar mövcuddur.

2018-ci il tarixli UEFA Statutunun 63-cü maddəsinin 1-ci hissəsinin a yarım bəndində sırf oyun qaydalarının tətbiqi ilə bağlı məsələlər və ya müsabiqədə texniki üsullarla bağlı mübahisələrdə CAS-a müraciət edilə bilməyəcəyi bildirilmişdir. Həmçinin FİFA Statutunun 67-ci maddəsində də oyun qaydalarının pozulması (violations of the laws of the game) halında CAS-a müraciət edilə bilməyəcəyi qeyd edilmişdir. Bunun səbəbi oyun qaydalarının nə olduğu, oyun qaydalarının pozulması halında hansı hüquqi tədbirlərin görülməsi və ya kimlər tərəfindən tətbiq ediləcəyi hər bir idman növünə uyğun olaraq milli və beynəlxalq federasiyalar tərəfindən hazırlanan oyun qaydaları ilə tənzimlənir. Burada futbolda olan oyun qaydaları misalları üzərindən qısaca oyun qaydaları haqqında məlumat vermək faydalı olacaqdır. Futbolda oyun qaydaları Beynəlxalq Futbol Assosiasiyası Şurası ( The İnternational Football Association Board) tərəfindən hazırlanır. Oyun qaydaları 2020/2021-də əsas tənzimlənən məsələlər bunlardır: Qayda 1-oyun meydanı; Qayda 2-top; Qayda 3-Oyunçular; Qayda 4-Oyunçuların geyimi; Qayda 5-Baş Hakim; Qayda 6-Matçın digər hakimləri; Qayda 7-Matçın davamiyyəti; Qayda 8-Oyunun başlanması və bərpası; Qayda 9-Topun Oyunda Olması və Olmaması; Qayda 10- Matçın Nəticəsinin Müəyyən Edilməsi; Qayda 11-"Oyundankənar" vəziyyət; Qayda 12-Qayda Pozuntuları və İntizamsız Davranış; Qayda 13-Cərimə və Sərbəst Zərbələr; Qayda 14-11 metrlik zərbə; Qayda 15-Topun Yan Xətdən Oyuna Daxil Edilməsi; Qayda 16-Qapıdan Zərbə; Qayda 17-Küncdən zərbə.

Hər bir matç, oyun qaydalarını tətbiq etmək üçün tam səlahiyyətə malik hakim tərəfindən idarə olunur. Qərarlar, oyun qaydalarına və "oyunun ruhu"na uyğun olaraq hakimin maksimal bacarığı çərçivəsində verilməli və oyun qaydaları çərçivəsində müvafiq tədbirlər görmək səlahiyyətinə malik hakimin fikrinə əsaslanmalıdır. Oyunla, habelə qolun qeydə alınıb-alınmaması və matçın nəticəsi ilə bağlı hakim tərəfindən verilmiş qərarlar qətidir. Baş hakimin və matçın digər hakimlərinin qərarlarına hər zaman hörmətlə yanaşılmalıdır. Əgər oyun bərpa edilmişsə, yaxud hakim birinci və ya ikinci hissənin (habelə əlavə vaxtın) başa çatdığını bildirən işarə vermiş və oyun meydanını tərk etmişsə, yaxud matçı təxirə salmışsa, hakim, qərarının yanlış olduğunu anlayaraq və ya digər hakimlərin məsləhəti ilə oyunun bərpası ilə bağlı qərarını dəyişə bilməz. Bununla belə, əgər

hissənin sonunda hakim video-təkrara baxış zonasına yaxınlaşmaq və yaxud oyunçuların oyun meydanına qayıtmasına göstəriş vermək üçün oyun meydanını tərk edirsə, bu, hissənin başa çatmasına qədər baş vermiş insidentə görə qərarın dəyişdirilməsinin qarşısını almır.

Oyun qaydaları ilə bağlı verilən qərarlardan yuxarıda qeyd etdiyimiz kimi CAS-a müraciət edilə bilməz. Atalanta yay olimpiya oyunları zamanı *Mendy v.İnternational Amateur Boxing Association* işində, CAS ad hoc hakim heyəti, fransız boksçunun rəqibinin onu beldən aşağısına vurması səbəbilə oyun qaydalarını pozması və yarışdan uzaqlaşdırılması ilə bağlı hakim qərarına fransız boksçunun verdiyi şikayəti oyun qaydalarına bağlı qərarlara qarşı şikayət verilə bilməz səbəbilə rədd edilmişdi. Lakin burada bir istisna hal nəzərdə tutulmuşdur. Əgər oyun qaydalarına bağlı qərarlar verilərkən qərəzli niyyətlə hərəkət edilmişsə o halda CAS şikayəti qəbul edib və araşdırma apara bilər (Wild ACAS and Football, 2012).

İdmanla əlaqəli mübahisələri subyekt tərkibinə görə milli və beynəlxalq xarakterli mübahisələrə ayıra bilərik. İdmanla əlaqəli mübahisənin tərəflərindən biri əcnəbi deyildirsə bu mübahisə milli mübahisə hesab edilir. Yox əgər mübahisənin tərəflərindən biri əcnəbidirsə o halda bu mübahisələri biz beynəlxalq xarakterli mübahisə adlandıracayıq. Məsələn Azərbaycandakı bir idman klubu ilə bir Azərbaycan vətəndaşı idmançı arasında idmanla əlaqəli bir mübahisə yaranmışdırsa bu milli xarakterli mübahisə hesab ediləcəkdir. Bu milli idmançının intizam pozuntusu törətməsi, oyun qaydalarını pozması, bir klubdan digər kluba transfer olması və ya dopinq qayda pozuntusunu törətməsi halında idmançının fəaliyyət göstərdiyi idmana aid qayda və təlimatlarla yanaşı Azərbaycan qanunvericiliyidə tətbiq ediləcəkdir. Bunun əksi olaraq yerli bir klubla əcnəbi idmançı arasında yaranan mübahisələri qeyd edə bilərik.

İdmanla əlaqəli mübahisələrin milli və ya beynəlxalq xarakter daşıması 3 baxımdan bizim üçün önəmlidir. Birincisi, idmanla əlaqəli mübahisələrə tətbiq ediləcək hüquqi rejimin müəyyən edilməsi, ikincisi, mübahisəni həll edəcək səlahiyyətli orqanın müəyyən edilməsi, üçüncüsü idmanla əlaqəli mübahisələrlə bağlı xarici ölkələrdə verilən qərarların tanınması və icrası ilə bağlı. Əgər idmanla əlaqəli mübahisə milli xarakterlidisə bu mübahisə milli hüquq orqanları və ya məhkəmələri tərəfindən baxılaraq qərar veriləcəkdir. Ancaq bəzi hallarda tərəflər milli xarakterli olsa belə tərəflər aralarında imzaladıqları müqaviləyə ilə mübahisələrinin baxılmasını CAS-a və ya digər xarici ölkələrin arbitraj məhkəmələrinə həvalə edə bilərlər. Milli xarakterli mübahisələr, mübahisənin aid olduğu idman növünə aid federasiyaların əsasnaməsi və təlimatları başda olmaqla milli hüququ tabedirlər. Buna qarşı olaraq qeyd edə bilərik ki, beynəlxalq xarakterli mübahisələrdə həm tətbiq olunacaq hüquq və mübahisəni həll edəcək orqan fərqlilik göstərə bilər. Bu vəziyyəti daha yaxşı başa düşmək üçün FİFA örnəyini göstərə bilərik. Beynəlxalq xarakterli hər bir mübahisə üçün FİFA orqanları səlahiyyətli göstərilməmiş bəzi hallarda milli məhkəmələrə və ya milli federasiyaların daxili hüquq orqanlarına müraciət edilməsi qəbul edilmişdir (4).

İdmanla əlaqəli mübahisələrin həllində məhkəmə orqanları ilə yanaşı idman qurumlarının tərkibində olan hüquq orqanlarına və ya arbirtraja müraciət etmək olur. Federasiyalar tərkiblərinə daxil olan hüquq orqanları həm inzibati orqan həm də arbitraj orqanı qismində çıxış edərək mübahisə ilə bağlı qərar verə bilirlər. Bütün bunları biz idman yurisdiksiyası adlandıra bilərik. Bu idman mübahisələri üçün 3 fərqli həll yolu var.

-Müvafiq milli və beynəlxalq idman təşkilatlarının icazə verdiyi dərəcədə onların səlahiyyətli hüquq orqanlarına müraciət etmək;

-Məhkəməyə müraciət etmək;

-Arbitraja müraciət etmək;

Müvafiq milli və beynəlxalq idman təşkilatlarının icazə verdiyi dərəcədə onların səlahiyyətli hüquq orqanları tərəfindən idmanla əlaqəli mübahisələrin həlli. Bildiyimiz kimi bir idman növündə yerli federasiya və assosiasiyalar beynəlxalq federasiya və assosiasiyalar tərkibində birləşirlər. Məsələn müxtəlif avropa ölkərinin assosiasiyaları UEFA-ya (Union of European Football Associations) yəni Avropa Futbol Assosiasiyaları İttifaqına üzvdürlər. Beynəlxalq federasiya və assosiasiyaların qəbul etdiyi təlimat və reqalamentlər milli üzv federasiyalar tərəfindən də mənimsənilərək yerli təlimat və reqlamentlər hazırlanır.

Milli və beynəlxalq federasiyalar səlahiyyətlərinə daxil olan mübahisələri həll etmək üçün müxtəlif hüquq orqanları yaratmaqdadırlar. Hər bir milli və beynəlxalq federasiyalar tərəfindən bu orqanlara verilən adlarda fərqlilik göstərməkdədir. Məsələn intizam pozuntuları ilə bağlı "İntizam Komitəsi" və ya maliyyə mübahisələri ilə bağlı "Oyunçuların Statusu və Transferi Komitəsi" vardır. Milli və beynəlxalq federasiyaların mübahisələrə baxan orqanları birinci instansiya orqanları hesab olunur və bu orqanların qərarlarından həmin milli və beynəlxalq federasiyaların apellyasiya orqanlarına şikayət vermək mümkün olur. Məsələn AFFA-nın İntizam Komitəsinin verdiyi bir qərardan Apellyasiya Arbitraj Tribunalının İntizam Palatasına şikayət vermək mümkündür. Lakin bəzi hallarda milli və beynəlxalq federasiyaların verdiyi qərarlar qəti olur və bu qərarlardan şikayət etmək mümkün olmur.

Azərbaycanda müxtəlif idman növlərini ilə bağlı federasiyaların tərkibində yaranmış mübahisələri həll edən müxtəlif hüquq orqanları vardır. Xüsusilədə futbolun idarə olunması və intizam pozuntuları ilə bağlı mübahisələri AFFA-nın tərkibində birinci instansiya və apellyasiya fuksiyalarını icra edən orqanlar yaradılmışdır. AFFA-nın nizamnaməsinin 46-cı maddəsində qeyd olunur ki, Hüquq tətbiqediciorqanlar Azərbaycan Respublikasının qanunvericiliyinin tələblərini, eyni zamanda FİFA və UEFA-nın normativ tələblərini nəzərə almaqla, AFFA tərəfindən müəyyən olunan norma və qaydalar əsasında intizam, maliyyə, və lisenziyalaşdırma məsələlərinə baxmaqda və qərarlar qəbul etməkdə səlahiyyətlidir. AFFA-nın birinci instansiya hüquq tətbiqedici orqanları aşağıdakılardır:

-İntizam Komitəsi;

-Oyunçuların Statusu və Transferi Komitəsi;

-İntizam üzrə müfəttiş;

AFFA-nın apellyasiya orqanı isə Apellyasiya Arbitraj Tribunalıdır. Hüquq tətbiqedici orqanlar və onların üzvlərinin səlahiyyət dairəsi, o cümlədən hüquq və vəzifələri İcraiyyə Komitəsi tərəfindən müəyyən olunur və İcraiyyə Komitəsi tərəfindən qəbul olunmuş müvafiq əsasnamələrdə öz əksini tapır.

Beynəlxalq xarakter daşıyan idmanla əlaqəli mübahisələr beynəlxalq idman qurumlarının tərkibində olan birinci instansiya və apellyasiya orqanları vasitəsi ilə baxılaraq həll olunur. Burada beynəlxalq idman qurumlarının tərkibində olan hüquq orqanları haqqında qısaca məlumat veriləcəkdir. İlk öncə 23 iyun 1894-cü ildə Parisdə Beynəlxalq konqresdə Fransa ictimai xadimi Pyer de Kubertenin təşəbbüsü ilə Olimpiya Oyunlarının dirçəldilməsi və təşkil olunması məqsədilə yaradılmış Beynəlxalq Olimpiya Komitəsinin (*International Olympic Committee* (İOC) hüquqi intizam prosedurunu nəzərdən keçirək. Olimpiya xartiyasının 59-cu maddəsinə əsasən Olimpiya Xartiyasının, Dünya Anti-Dopinq Qaydalarının və ya hər hansı bir təlimatın pozulması halında BOK-un Ümumi Yığıncağı, İdarə Heyəti və İntizam Komissiyası hüquqi tədbirlər görə və qərarlar verə bilər. Olimpiya xartiyasının 59-cu maddəsində həmçinin hansı hallarda Ümumi Yığıncağın və ya İdarə Heyətinin işə baxacağı və qərar verəcəyi o cümlədən hansı orqanın hansı qərarları verə biləcəyidə öz əksini tapmışdır. Olimpiya Xartiyasının Tədbirlər və Sanksiyalar, İntizam Prosedurları və Mübahisələrin Həlli adlı 6-cı bölməsi bütünlüklə bu məsələlərə həsr edilmişdir (5).

Olimpiya Xartiyasının 60-cı maddəsi BOK qərarlarına etiraz adlanır. Həmin maddəyə əsasən bütün arbitraj və apellyasiya məhkəmə prosesi üçün tətbiq olunan qaydalara, iddia müddətlərinə və Ümumdünya Antidopinq Məcəlləsinənin müddəalarına tabe olmaq şərti ilə, sıralamalar və yarışmaların nəticələri də daxil olmaqla lakin bunlarla məhdudlaşmadan, BOK tərəfindən verilən hər hansı bir qərara qarşı Olimpiya Oyunlarının bağlanış günündən etibarən üç il keçdikdən sonra etiraz edilə bilməz.

Həmçinin Olimpiya Xartiyasının 61-cı maddəsi mübahisələrin həlli adlanır. Bu maddədə qeyd olunur ki, BOK qərarları qətidir. Onların tətbiqi və təfsiri ilə bağlı hər hansı bir mübahisəni yalnız BOK İdarə Heyəti, bəzi hallarda İdman Arbitraj Məhkəməsi (CAS) həll edə bilər. Olimpiya Oyunları ilə əlaqəli yaranan və ya bununla əlaqəli hər hansı bir mübahisə, İdman Arbitrajının Əsasnaməsinə uyğun olaraq yalnız İdman Arbitraj Məhkəməsinə (CAS) veriləcəkdir.

Avropa Futbol Assosiasiyaları İttifaqı (Union des Associations Europeennes de Football-UEFA) Avropada və Asiyanın bəzi (bir qədər) qərb regionlarında futbolu idarə edən təşkilatdır. O Avropa ölkələrinin milli futbol assosiasiyalarını birləşdirir. UEFA klubların və yığmaların bütün avropa yarışlarının təşkiliylə məşğul olur, onun tərkibinə daxil olan klubların və milli assosiasiyaların arasında reklamdan və translyasiyalardan gəlirləri bölür.

UEFA Statutunun 32-ci maddəsinə əsasən UEFA-nın hüquq orqanları aşağıdakılardır:

a)UEFA intizam qurumları:

- Nəzarət, Etik və İntizam Qurumu (Control, Ethics and Disciplinary Body);
- Apellyasiya Şurası (Appeals Body);

b) Etik və İntizam Müfəttişləri (Ethics and Disciplinary İnspectors);

c) Klub Maliyyə Nəzarəti Qurumu (Club Financial Control Body) .

Hüquq orqanlarının üzvləri müstəqildirlər və UEFA-nın başqa bir orqanına və ya Komitəsinə üzv ola bilməzlər. Hər hansı bir mənfəət toqquşmasının mövcud olduğu və ya mövcud olduğu qəbul edilən bir mövzu ilə əlaqədar heç bir tədbir görməyəcək və təsir göstərməyəcəklər. Bu orqanlar yalnız UEFA Əsasnaməsi, qaydaları və qaydaları və qanunları ilə bağlıdır.

UEFA Statutunun 33-cü maddəsinə əsasən, Nəzarət, Etik və İntizam Qurumu əsas olaraq intizamla bağlı məsələlərdə səlahiyyətlidir. UEFA Statutunun 34-cü maddəsinə görə, Apellyasiya Şurası, Nəzarət, Etik və İntizam Qurumunun qərarlarına qarşı intizam təlimatlarına uyğun olaraq edilmiş şikayətləri araşdıraraq və qərar vermək səlahiyyətlərinə malikdir. UEFA Statutunun 34 bis maddəsinə əsasən Etik və İntizam Müfəttişləri, Nəzarət, Etik və İntizam Qurumunda və Apellyasiya Şurasında baxılan işlər zamanı UEFA-nı təmsil edirlər.

Apellyasiya Şurası və Klub Maliyyə Nəzarəti Qurumu tərəfindən verilən qərarlar son qərarlardır və icrası məcburidir. Ancaq bu qərarlara qarşı CAS-a müraciət etmək mümkündür. UEFA-nın hüquq orqanları tərəfindən verilən qərarlardan işdə iştirak edən və qərardan narazı qalan tərəflər CAS –ın Apellyasiya Arbitraj Dairəsinə şikayət verə bilər. CAS-a müraciət müddəti qərarın alındığı vaxtdan etibarən 10 gündür. CAS –ın Apellyasiya Arbitraj Dairəsinə müraciət edə bilmək üçün UEFA daxilində müəyyən edilən prosedurların bitməsi lazımdır. CAS –ın Apellyasiya Arbitraj Dairəsinə müraciət UEFA tərəfindən verilmiş qərarın icrasını dayandırmır. Ancaq CAS hakim heyəti, intizam cəzasının icrasının dayandırılması barədə qərar verə bilər. İstisna olaraq UEFA Statutunun 63-cü maddəsinə əsasən aşağıda qeyd edilən məsələlərlə bağlı CAS-a müraciət edilə bilməz:

a) sırf idman qaydalarının tətbiqi ilə bağlı məsələlər, Oyun Qaydaları və ya bir yarışmanın texniki üsulları kimi mübahisələr;

b) iki matç və ya bir aya qədər müvəqqəti yarışdan uzaqlaşdırılma ilə bağlı cəzalara qarşı;

c) federasiyaların nizamnamələrinin və ya qaydalarının tətbiq edilməsindən irəli gələn milli miqyaslı bir mübahisədə müstəqil və qərəzsiz bir arbitraj məhkəməsi tərəfindən verilən qərarlara qarşı (Yohan).

İdmanla əlaqəli federasiyaların əsasnamələrində və təlimatlarında yerli məhkəmələrə hansı hallarda müraciət edilə biləcəyi göstərilir. Bəzi ölkələrin qanunvericiliyində məsələn Türkiyə Respublikasının qanunlarında, idmanla bağlı mübahisələrlə bağlı məhkəmələrə müraciət yolu Konstitutsiyanın özü tərəfindən bağlanmışdır.Bu səbəbdən idmanla əlaqəli mübahisələrlə bağlı Türk məhkəmələrində iddia qaldırmaq mümkün deyil.

AFFA-nın Nizamnaməsinin 67-ci maddəsində qeyd olunur ki, AFFA, onun üzvləri, oyunçuları, vəzifəli şəxsləri, habelə vasitəçilər Azərbaycan Respublikasının qanunvericiliyi ilə qadağan olunmadıqda, hər hansı mübahisəli məsələni adi məhkəmələrə çıxarmır. İstənilən mübahisə FİFA, UEFA və ya AFFA-nın yurisdiksiyasına təqdim olunur. Həmin nizamnamənin 68-ci maddəsinin 5-ci hissəsində qeyd olunur ki, qanunvericilikdə digər hal nəzərdə tutulmayıbsa, AFFA-nın orqanları tərəfindən qəbul olunmuş idman xarakterli qərarlarla əlaqədar mülki məhkəmələrə müraciət olunması istisna olunur. AFFA Konfransı tərəfindən qəti və mübahisəsiz olaraq qəbul edilmiş qərarlar istisna olmaqla, hər hansı bu cür qərarlar Azərbaycan qanunu ilə birbaşa qadağan olunmadığı halda baxılmaq üçün yalnız bu Nizamnaməyə uyğun olaraq yaradılmış mübahisəni qəti olaraq tənzimləyəcək Apellyasiya Arbitraj Tribunalına təqdim oluna bilər.

İsveçrə Federal Məhkəməsi idman mübahisələrinə dair ən geniş yurisdiksiyaya malikdir. CAS tərəfindən verilən qərarların həm adi arbitraj prosedurunda, həm də apellyasiya arbitraj prosedurunda ləğvi üçün işlər İsveçrə Federal Məhkəməsində baxılır. Digər tərəfdən, İsveçrə Federal Məhkəməsinə Olimpiya oyunları və mühüm beynəlxalq yarışlar üçün yaradılan Xüsusi Hakim heyəti qərarlarının ləğvi üçün bir müraciət edilə bilər. Üstəlik, CAS qərarları, məsələn, eyni ölkədə və eyni vətəndaşlıqda olan

idmançılar, klublar və ya federasiyalar arasındakı mübahisələr, habelə beynəlxalq və ya hətta olimpiya hərəkatları və WADA ilə bağlı mübahisələrlə əlaqəli ola bilər. CAS qərarlarının milli və ya beynəlxalq xarakteri, CAS qərarlarının ləğvi üçün açılan iddialarda İsveçrə Federal Məhkəməsinin qəbul etdiyi qərarları da təsir edir. Nəticədə, İsveçrə Federal Məhkəməsinin CAS qərarlarının ləğvi ilə bağlı qərarlarının transsərhəd təsirləri ola bilər. Əlavə olaraq, CAS İsveçrədə olduğundan, CAS arbitraj məhkəmələri dəlil və digər məsələlərlə bağlı İsveçrə məhkəmələrindən yardım ala bilərlər (7).

Milli məhkəmələr dopinq mübahisələrində, habelə danışılmış oyunlarla bağlı məsələlərdə cinayət təqibini həyata keçirə bilərlər. Əlavə olaraq, mərc oyunları və dopinqlə bağlı intizam araşdırmalarında, cinayət mühakimə orqanları tərəfindən çıxarılan qərarlar və ya toplanan dəlillər, idman təşkilatları tərəfindən həyata keçirilən intizam icraatında da istifadə edilə bilər. İdmanın milli məhkəmələrin səlahiyyətindən çıxdığı mövzular daha çox idman təşkilatlarının fəaliyyət sahələri və bu strukturlardakı mübahisələrin həlli şuralarıdır. Əslində, həm milli, həm də beynəlxalq idman təşkilatlarının statuslarında və qaydalarında bu məsələlərlə bağlı məhkəmələrə müraciət etmək qadağandır; məhkəmələrə müraciət edənlər üçün intizam cəzaları belə nəzərdə tutulur.

## Nəticə

Günümüzdə sürətlə qloballaşan idman günlük yaşamımızın ayrılmaz hissəsinə çevrilmişdir. Bu səbəblə idman subyektləri arasında yarana biləcək mübahisələrin özünəməxsus qaydalarla həll edən idmandakı hüquqi tənzimləmələri sistematik bir şəkildə incələyən bir hüquq sahəsi olan idman hüququ özündən formalaşmışdır.

İdmanın hər sahəsində qloballaşma xüsusilə keçən əsrdə beynəlxalq idman mübahisələrinin gedərək artmasının nəticəsi olaraq beynəlxalq idman təşkilatları tərəfindən idman mübahisələrinin qısa müddət ərzində idman hüququnun və idmanın ruhuna uyğun şəkildə həll edə biləcək müstəqil arbitraj məhkəməsinin meydana gətirilməsi məcburiyyətini doğurmuşdur. Bu səbəbdən 1984-cü ildə ingiliscə adı Court of Arbitration For Sport (C.A.S) və ya fransızca adı Tribunal Arbitral Du Sport (T.A.S) olan idmanın dünyadakı ən üst məhkəmə orqanı yaradılmışdır. CAS beynəlxalq idmana xidmət edən və idman hüququ ilə bağlı mübahisələrin ən qısa müddət ərzində həll etmə səlahiyyəti olan müstəqil məhkəmədir (8).

## Ədəbiyyat


1. Eriner, E. (2010). International Sports Arbitration Court C.A.S: Textbook. Istanbul: "Twelve Plate Publications", 275 p.
2. Ekshi, N. (2015). Sports Arbitration Law: Textbook. Istanbul: Beta Publications. 696 pp.
3. Wild ACAS and Football: Landmark Cases, 2012.
4. https://www.tas-cas.org/en/arbitration/code-procedural-rules.html
5. https://www.tas-cas.org/en/general-information/history-of-the-cas.html
   Yohan, L. The Court of Arbitration for Sport and its Jurisprudence.
6. http://www.injuria.az›news›-dman-arbitraj-mehkemesi
7. https://www.tas-cas.org/en/information/history-of-the-cas.html


Göndərildi: 14.10.2021 Qəbul edildi: 13.12.2021

DOI: https://doi.org/10.36719/2706-6185/06/16-20

**Nubar Yahyabala qızı Bağıyeva**
Azərbaycan Dövlət Rəssamlıq Akademiyası
magistrant
nubarbagiyeva@gmail.com

# XALÇAÇI RƏSSAM MƏMMƏDHÜSEYN HÜSEYNOVUN XALÇA KOMPOZİSİYALARI

**Xülasə**

Rəssam müxtəlif mövzu və üslub seçimi ilə əvvəllər mövcud olan bədii irsin ən gözəl ənənələrinin diqqətini cəlb edən dəyərli sənət əsərləri yaratmışdır. O, hər hansı predmetin əks olunduğu mühiti səciyyələndirən ifadəli obrazlar yaratmış, milli motiv elementlərinə yer açmağa çalışmışdır. Bu, onun zəngin bədii təxəyyülünün və incə zövqünün göstəricisidir. Xalçaçı rəssamın yaratdığı xalçalar ornamentlərin çox mürəkkəb və çox yönlü olması ilə seçilir. Bu xalçaların ornamenti hələ uzun müddət tədqiqat obyekti olaraq qalacaq, çünki onun bədii-sxematik estetik, mənəvi-emosional məzmunu tükənməz bir xəzinədir. Xalçaçı rəssamın yaratdığı xalça naxışları ilk baxışdan tamaşaçıların diqqətini cəlb edir. Onun müəllifi olduğu xalçalar həmişə maraq, sevgi və rəğbətlə qarşılanır.

***Açar sözlər:*** *Məmmədhüseyn Hüseynov, təsviri incəsənət, xalça sənəti, kompozisiya, ornament*

**Nubar Yahyabala Baghiyeva**
Azerbaijan State Academy of Artist
master student
nubarbagiyeva@gmail.com

## Carpet compositions by carpet artist Mammadhuseyn Huseynov

**Abstract**

The artist has created valuable works of art that attract the attention of the most beautiful traditions of the pre-existing artistic heritage with a choice of different themes and styles. He created expressive images that characterize the environment in which any subject is reflected, and tried to make room for elements of national motives. This is an indication of his rich artistic imagination and delicate taste. The carpets created by the carpet artist are distinguished by the fact that the ornaments are very complex and very versatile. The ornament of these carpets will remain the object of research for a long time, because its artistic-schematic aesthetic, spiritual and emotional content is an inexhaustible treasure. The carpet patterns created by the carpet artist attract the audience's attention at first sight. The carpets he authored are always met with interest, love and appreciation.

***Keywords:*** *Mammadhuseyn Huseynov, fine art, carpet art, composition, ornament*

## Giriş

Yaratdıqları sənətkarlıq nümunələri ilə xalçaçılıq sənətimizi inkişaf etdirirən sənətkarlar sırasında Məmmədhüseyn Hüseynovun adını xüsusi qeyd etmək olar. Onun 20-dən çox xalça əsərləri, 100-dən çox çeşniləri mövcuddur. Onun yaradıcılığında geniş yer alan xalçalar ilk növbədə mövzu zənginliyi ilə seçilir. "Azərbaycan oğuz dünyası" adlı xalçasında süjet xətti ilə yanaşı Gəmiqaya, Qobustan və Abşeronda olan bəzi tarixi abidələr kodlaşdırılmış şəkildə əks olunmuşdur. Onun "Merac", "Yeni Xətai", "İthaf", "Karvan", "İslimibəndlik", "Kəhkəşan" və s. kimi orijinal kompozisiyaları yerli muzeylər və dünyanın müxtəlif şəxsi kolleksiyalarında qorunub saxlanılır. Azərbaycan xalqının milli mədəniyyətinin və incəsənətinin əvəzsiz xalça nümunələri ilə birgə müasir dövr rəssam və xalq sənətkarlarının ən nümunəvi əsərləri toplanan Azərbaycan Milli Xalça

Muzeyinin kolleksiyasına Məmmədhüseyn Hüseynovun "Ov səhnəsi" xalçası daxil edilmişdir. Xalçaçı rəssam bu xalçanı "Ov səhnəsi" miniatürü əsasında yaratmışdır. Miniatür rəssamlığının çiçəklənmə dövrü XVI əsrə təsadüf edir. Təbriz məktəbinin misilsiz miniatürləri yalnız həmin dövr üçün deyil, həm də müasir dövr xalça sənətinə təsirini parlaq şəkildə əks elətdirir. Təbriz miniatür məktəbinin banisi Sultan Məhəmmədin "Şah ovu" (1549) diptixində verilən təsvirlər Ə.Caminin "Qızıl zəncir" əlyazması əsasında çəkilmişdir. Süjetli xalça toxuma ənənəsi indi də davam edir. Bu xalça real motivlərinin və dekorativ bəzək ünsürlərinin ahəngdar uzlaşdırılması naxış və rəng həllinin incəliyi ilə seçilir. Bu da xalçanın əyani şəkildə yüksək səviyyəli peşəkar sənət nümunəsi olduğunu göstərir. Müəllif miniatürün sol tərəfində təsvir olunan ov səhnəsini xalçada ilmələr vasitəsilə əks etdirmişdir. Ara sahə miniatür əsasında tərtib olunsa da, haşiyələr rəssamın öz yaradıcılıq təxəyyülünün bəhrəsidir. Ara sahə və haşiyələrdəki təsvirlər və rəng koloriti bir-birini harmonik surətdə tamamlayır. Haşiyədə verilən "S"- vari əjdaha təsvirinin yaşıl rəngdə olması onun təbiətin qoruyucusu olduğuna işarədir. Belə ki, o, ceyranı udmayaraq onu şanagülləyə (lotos)- təbiətə bəxş edir. Göydəki buludlar Çin rəssamlığında olduğu kimi təsvir edilmişdir. Yaz mövsümü kompozisiyanın əlvan və parlaq rəng sxeminə səbəb olur. Bütün heyvanlar; vəhşi keçi, qoyun ,maral, qaban, bəbir dərədə ovlanılır. Atlılar onları oxlarla vururlar. Rəsimdə bir neçə dağ silsiləsi işlənib və onlar ön plandakı dərəni əhatələyir. İnsanların əksəriyyəti o vaxt ümumiyyətlə olduğu kimi profildə deyil, dörddə üç təsvir edilib, əks halda onların arxaları görünərdi. Yaralanan heyvanla, insanlar, qayalar və hətta buludlar gərgin bir miniatür atmosferi yaradır. Komopozisiyann üst hissəsi dağ yolu ilə irəliləyən böyük bir karvanın təsviri ilə tamalanır. Ov səhnələri şərq miniatürlərində kifayət qədər geniş yayılmıdır. Lakin komopozisiyann elementləri, personajları və mənzərəsi bu miniatürün başqalarından seçilməsinə səbəb olur. Canlı ifadəli obrazlarda Səfəvi dövrünün insanlarının həyatından bir çox motivlər daşıyan diptixin idrak dəyərini qiymətləndirmək çətindir. Eyni zamanda yalnız çox böyük və təcrübəli bir usta təsvir olunan bütün səhnələri sərbəst və bədii şəkildə tamamilə bütöv bir dekorativ kompozisiyada birləşdirə bilər. Kompozisiya sürətli hərəkət ritmi, saf və parlaq rənglərdən ibarətdir. Rəngarəng personaj və simvollar incə nəbati naxışlar təbriz xalça və miniatür üslubu ilə ustalıqla işlənib (1).

Xalçaçı rəssam rəmzi mahiyyətli elementlərlə toxunmuş "Yeni Xətayi" adlı xalçasında klassik Azərbaycan xalçasına müraciət edərək "Xətayi" adlı xalça kompozisiyasını örnək götürərək müasir yaradıcılıq dilində yeni bir dəyərli əsər yaratmışdır. Xalça kompoziyasıları arasında "Xətayi" seçilən önəmli naxış ornamentlərindən biridir. Bəzən həddən artıq stilizə olunmuş bu element kənarları dilikli olan həndəsi formalı elementi xatırladır. Bu naxış ornamentin əsas aparacı motivləri olan kompozisiyalar "Xətayi" və əjdahalı adları ilə tanınır. Bu cür kompozisayada toxunulmuş bir çox xalçalar dünya müzeylərinin nadir inciləridir. M.Hüseynovun "Xətayi" kompozisiyayalı xalçasına diqqət yetirək. Bu kompoziyasının əsas elementlərindən olan göllər şaquli istiqamətli ox üzərində yerləşdirilib. Kompozisyanın əsas elementlərindən olan xətayi motivləri göllərdən yanlara istiqamətlənən bir-birinə çarpacaq şəkildə təsvir olunub. Çarpazlaşan xətayi motivlərin əmələ gətirdiyi zəncirvari hissələrdə isə "Xətayi" kompozisyası üçün xarakterik olan "əjdaha" adlandırılan elementlərin təsviri verilir. Müxtəlif ornamentlər isə kompozisyanın əsas aparıcı elementlərin və ümumi ara sahəsinin dolducu elementləri kimi təsvir olunmuşdur. Kompozisyanın ara sahəsində çarpaz şəkildə yerləşdirilən "xətayi" motivləri ana haşiyənin aparıcı elemetləri kimi çıxış edir. Xətayi kompozisyasını əmələ gətirən mürəkkəb formalı Xətayi motivləri X- şəkilli bir-birinə çarpaz şəkildə şaquli istiqamətdə yerləşdirilib. Xətayi elemetlərinin üzəri onların bəndləri sanki ləcəkli yarpaq kimi nəbati, zoomorf, rəmzi mahiyyətli elementlərlə bəzədilmişdir. Bu cür təsvirlər kompozisyanın həm ara həmdə haşıyə zolağında müşahidə olunur. "Yeni Xətayi" xalçasına diqqət yetirdikdə görür ki, bu xalçanın həm ara sahəsində həmdə haşiyəsindən həddən artıq təhrif edilmiş əjdaha motivi əsas element kimi təsvir olunmuşdur (Huseynov).

Nəbati elementlərlə tərtib edilmiş "Xeyir və şər" kompozisiyası özünəməxsusluğu və sirliliyi ilə diqqəti cəlb edir. Xalçaçı rəssam həmin elementləri yaradıcılıqla işləyərək mövcud ornamental ənənələrlə birləşdirmiş və Əjdaha ilə Simurq quşunun döyüşünü təsvir edən yeni ornamental

kompozisiya olan "Xeyir və Şər" xalçasını yaratmışdır. Quruluşu mifik elementlərdən tərtib edilmiş əsər məna və məzmun yükünə, koloriti və bədii təsir qüvvəsinə görə olduqca diqqətçəkicidir.

Məmmədhüseyn Hüseynovun nəbati elementlərlə tərtib edilmiş digər xalçası "Xeyir və şər" adlı "İslimibəndlik" xalçasıdır. Nəbati elementlər adından da aydın olduğu kimi təbiətdən götürülmüş müxtəlif yarpaqların, gül, çiçəklərin, ağacların və s. Bitkilərin stilizə olunmuş (həndəsilədirilmiş) yaxud da realistik təsvirlərdən ibarətdir. Xalçaçılıq sənətində geniş yayılan nəbati elementlərdən biri də islimi motividir. İslimilərin bir-birinə birləşərək əmələ gətirdiyi kompozisiyaya "islimibəndlik" deyilir. İslimibəndlik Azərbaycan dekorativ-tətbiqi sənətində işlənən ornamental kompozisiyalardan hesab olunur. İslimi motivlər formasına görə dalğavari xətt üzərində yerləşir, bir tərəfi yuxarı qalxır, o biri tərəfi aşağı enərək üzərində gül, çiçək, yarpaq bənd olunur. Bəzən spirala bənzər dairəvi forması ilə xalçanın ara sahəsini bütövlükdə bəzəyən baş və sonunda haçalanmış çiçəklərlə bəzədilən qıvrılmış formalı islimi elementini ilanın açıq ağzına da bənzədirlər. Bu element təsvir üsuluna görə öz dinamikliyi və daim hərəkətdə olması ilə səciyyələnir, daha gözəl görünür. M.Hüseynovun "İslimibəndlik" kompozisiyalı xalçasına diqqət yetirək. Xalçanın əsas aparıcı motivləri mərkəzdən yanlara şaxələnən islimilərdən ibarətdir. Bu xalçada islimi elementlərin elementlərin əmələ gətirdiyi ara sahədə xeyir ilə şərin mübarizəsi kimi əfsanəvi əjdaha və simurq quşunun döyüşünü görə bilərik. Kompozisiyanın islimi, aparıcı elementlərinin üzəri və ümumi ara sahə bədii quruluşlu budaqlar və realistik nəbati motivlərlə bəzədilmişdir. Bu isə insanlığın eyni kökdən yarandığını göstərməklə bərabər, hər kəsin qiyamət görəcəyi anlamına gəlir. Bu naxışda iştirak edən spiral uzaq keçmişlərdən istifadə olunmuş bəzək növüdür. Ornament olaraq qıvrılmış, sürünən, pusquda duran və s. vəziyyətlərdə təvir edilmiş əjdahalar şər qüvvəsi kimi təsvir olunur.

Rəssamın yaradıcığında ədəbi süjetlərdə rast gəlinir. Klassik şərq ədəbiyyatının ənənəvi motivlərini əks etdirən süjetli kompozisiya klassik xalça üslub və kompozisya prinsipilərini özündə saxlayaraq həmçinin realist rəssamlığın təsiri xalçada hiss olunur. Dəqiq proposiyaların süjet sahəsinin ümumi dekorla vəhdətdə simmetrlik qanunauyğunlarından istifadə edilməsi və koloritin ahəngdarlığı ilə işlənmiş xalça sənətinin gözəl nümunələrindən biridir. "Fizuli dünyası" əsəri ifadəli şərh və oriinallığı ilə fərqlənir. Kompozisiyada Leyli və Məcnun poemasından epizodlar isə Fizulinin və onun qəhrəmanlarının mənəvi aləmini daha da açmağa imkan verir. Mürəkkəb kompozisiyalı, çoxfiqurlu əsərin süjet xəttini ona cəlbedici və yaddaqalan bir bədii görkəm verməyə nail olub. "Fizuli dünyası" xalçası adından da göründüyü kimi dahi Məhəmməd Füzulinin sənət dünyasına həsr olunub. Asimmetrik kompozisiyada şairin və onun şah əsəri sayılan nakam məhəbbət dastanı "Leyli və Məcnun"un qəhrəmanlarının talelərinə tutulan fəlsəfi-obrazlı əsər yaratmışdır. Mərkəzi kompozisiyaya daxil edilmiş digər obraz və elementlərin hamısının da müəyyən fəlsəfi məzmun daşıdığını nəzərə alanda, əsərin çox tutumlu bir nümunəyə çevrildiyini yəqinləşdirmək olur.xalçanın haşiyə qurşağı ara sahə ilə səsləşərək islimi bulud və digər naxışlarla bəzədilib. Ornamentçi və xalçaçı rəssam Məmmədhüseyn Hüseynov süjetli xalçaların yaradılması zamanı həmin dövr ənənələrini davam etdirərək dahada kamilləşdirir. Bu xalça nümunəsində süjetə uyğun tərzdə toxunan kətəbələr içərisindəki sujet və ornamentləri öz hikməti ilə tamlıq alilik məqamına ucalır. Xalçanın kolorit həlli onun əsas xüsusiyyətlərindən biridir. Hər hansı bir rəsm əsərində olduğu kimi xalça da da rəng effekti ilə diqqəti cəlb edir. Ara sahənin və haşiyənin rənglərinin , fon və ornamentinin kompozisiyanın naxışının ən xırda detallarının ahəngdar şəkildə uzlaşdırılması xalçada estetik gözəllik yaradır. Tünd sürməyi rəngdə verilən ara sahə insan ömrünün müdriklik çağının rəngidir. Haşiyələrdə istifadə olunan şəkəri (sarı) rəng qəm qüssədən ayrılığı, istiliyi, qırmızı mübarizəni qəhrəmanlığı yeni həyatı və s. rəmzləri simvolizə edir. Realizmi və yüksək bədii emosional dili seçilən portret düşüncə içərisində təsvir olunmuşdur. Əsrdə ara sahə və haşiyə bir biri ilə harmonik vəhdətdədir. Orijinal bədii həllə malik xalçada rəssam yüksək kompozisiya qurmaq məharətini bir daha nümayiş etdirmişdir. Xalçanın kompozisiyası sujetli ornamental quruluşa malikdir (Huseynov).

Həndəsi və kufi elementləri ilə tərtib edilmiş "Sufi" xalçası maraqlı tərtibatı ilə diqqəti cəlb edir. Xalçaçı rəssamın 28 kompozisiyadan ibarət Məkkə-Mədinə məktəbinə aid "Sufi" adlı əsərinə görə 2002-ci ildə Gənclər, İdman və Turizm Nazirliyinin "Gənclər mükafatına" layiq görülüb. Sufi

xalçasının element və atributları islam fəlsəfəsi əsasında qurulmuşdur. Əsasən kodlu elementlərlə tərtib olunmağa üstünlük vermişdir. Dekorativ xüsusiyyətli naxış şəkilli yazılar xalça üzərində özünəməxsus şəkildə tətbiq olunmuşdur.Təqdim olunan "Sufi" xalçasının üzərindəki yazıların semantikası həmin xalçanın mahiyyəti və məzmunundan irəli gəlir. Yazılar xalçanın ümumi kompozisyası ilə sıx vəhdət təşkil edir. Yazıların bədii tərtibatına gəldikdə onlar xalça kompoziyasında həmdə müstəqil həm də kətəbə və səkkizgüşə elementin daxilində yazılması müşahidə olunur. Xalçanın haşiyəsi isə həndəsiləşdirilmiş kalliqrafiya elementi ilə bəzədilib. Kompozisyanın haşiyəsində dekor sistemində həndəsiləşdirilmiş yazı və kalliqrafiya elementlərindən geniş istifadə olunub. Xalçada yazılar haşiyə sisteminin əsas motivləri kimi müşahidə olunur. Xalçada dini yazılar ara sahə və haşiyənin əsas köməkçi doldurucu elementi kimi verilmişdir.Kompozisyasın üfüqi mərkəz xəttindən yuxarı hissədə təsvir olunan mehrab formasını yaradan tağvari elementi içərisi olan ara sahəsinin yerliyi üç hissəli haşiyə zolağında Allah sözü yerləşdirilmişdir. Xalça üzərindəki təsvirlərə diqqət yetirdikdə biz onların bir qayda olaraq tam halda deyil müəyyən hissələrini stilizə olunmuş hissələrinə daha çox rast gəlirik. Şaquli düz xəttlərdən məharətlə istifadə edən sənətkar sütun elementinin məna yükünü dərk edərək bu xalçanın kompozisiya quruluşunu göstərmək istəmişdir. Sütun (dirək) anlayışının təsviri məcid memarlığından qaynaqlanmış və təkmilləşərək inkişaf etdirilmişdir. Rəssam Məkkə Mədinə məktəbinə aid Sufi xalçasında bədi formanın məzmuna uyğun gəlməsinə diqqət yetirmiş və məzmun ilə formanın vəhdətini qorumuşdur. Xalçanın kompozisiya quruluşundakı ara sahədəki paralel şəkildə tərtib edilmiş bölmələr sufizmə görə həqiqətə çatmanın dörd mərhələsinə (şəriət, təriqət, mərifət, həqiqət) işarədir. Və hər mərhələ tərtib edilmiş element və simvolik işarələri ilə birlikdə Sütun elümentinin üzərində qurmaqla xalçanın məzmununu sufizm ideyalarına bağlamaqla düşündürücü və gözəl kompozisiya yaratmışdır. Bu cür dini mövzuda toxunan Sufi xalçalarında sütun motivini əsas elementlərdən biri kimi verilməsi həm də həndəsi şaquli düz xəttin həcimli görünüşü ilə memarlıq elementi kimi bədii forma tapır. Xalçada təsvir edilmiş səkkizgüşəli ulduz elementlərinin tarixi çox qədim dövrlərə təsadüf edir. Hələ Manna dövründə bu torpaqda yaşayan əjdadlarımızın səma cisimlərinə sitayiş edirdilər. Bu xalçada bütövlükdə kontraslı rəng uzlaşmaları üstünlük təşkil edir və özünəməxsus şəkildə həll olunmuşdur. Xalçann ara sahəsində və göllərin üzərində çoxayaqlı heyvan təsvirləri verilmişdir. Dördayaqlı olmasına baxmayaraq bu stilləşmiş təsvirlər fantastik quş kimi yozulur.

Xalçaçı rəssam M.Hüseynov xüsusiyyətindən irəli gələrək portret janrına o qədər üstünlük verməsə də, yaradıcılığında az sayda da olsa bir neçə portret xalçaları vardır. Bu qəbildən əsərlərinə nümunə olaraq Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin obrazını canlandıran portret-xalçasını göstərmək olar. Xalçanın əsas hissəsində prezidentin məğrur və möhtəşəm təsviri verilib. Rəhbər obrazının dərin ifadə vasitələrinin axtarılması M.Hüseynovun fərdi düşüncə tərzinin məhsuludur. Xalçanın bədii tərtibatında sadə və zərif ornamentlərdən istifadə edilib. Bu, ara sahədə yerləşən portretin daha aydın və qabarıq görsənməsinə imkan yaradır.Sürməyi rəngli tirmə üzərində portret olduqca canlı təsvir edilib. Ana haşiyədə islimi, islimibəndlik naxışlarından istifadə olunub. Bu hissədə ornamentlərin incə, zərif və eyni zamanda qarışıq toxunuşu xalçaya bədii görkəm bəxş edir. Xalçada rəssamın parlaq rəng tonlarına etdiyi əlavələr ümumi koloriti canlandırır. Burada biz, bir növ, ənənəvi növün davamı və inkişafını görürük (Tagiyeva).

## Nəticə

Xalçaçı rəssam Məmmədhüseyn Hüseynovun xalça yaradıcılığına nəzər yetirdikdən sonra deyə bilərik ki, onun Azərbaycan təsviri sənət aləminə bəxş etdiyi bənzərsiz əsərləri bir çox gənc istedadlı rəssamların inkişafına təkan verəcək və xalça sənətimizi daha da inkişaf etdirəcək. Onun yaradıcılığının xarakterik xüsusiyyətləri kimi forma və məzmun dolğunluğu, mövzuya sərbəst və peşəkarlıqla yanaşma qabiliyyəti, kompozisiya qurma məharətini, zəngin kolorit həllini qeyd etmək olar.Rəssam yaratdığı xalçaların kolorit xüsusiyyətlərinə-xalçaların fonuna, rənglərin uzlaşdırılması, ara sahə və haşiyənin rəng nisbətinə xüsusi diqqət yetirmiş, xalçaların rəng koloritində əsas prinsip olaraq müəyyən rənglərin uzlaşdırılması ilə alınan təzada, rəng ahəngdarlığı əsasında onun

ornament və kompozisiya ilə üzvi əlaqəsinə, ara sahə və haşiyə fonunun rəng vəhdətinə hər zaman nail olmuşdur.

### Ədəbiyyat

1. https://azcarpetmuseum.az
2. Huseynov, M. Border elements in carpet art and their structure.
3. Huseynov, M. Pattern memory in carpet art.
4. Tagiyeva, R. Azerbaijan carpet.
5. https://azerbaijan.az/information/508-in
6. http://www.anl.az/down/meqale/palitra/2019/dekabr/689833.htm-in
7. https://news.milli.az/culture/271679.html
8. https://www.medeniyyet.az/page/news/54033/Azerbaycan-xalcalari-XIX-esr-ressamlarinin-eserlerinde.html-i

Göndərildi: 05.10.2021 Qəbul edildi: 10.12.2021

DOI: https://doi.org/10.36719/2706-6185/06/21-24

**Chingiz Nasimi Chingizzadeh**
Baku State University
master student
cingizzadec@gmail.com

# HUMAN RIGHTS RELEVANT TO TRADEMARKS

**Abstract**

Human rights and trademark laws do not go well together. This is partly the result of an educational tradition and the division of legal research into private and commercial law on the one hand and public law, international law and human rights law on the other. This division is also reinforced by the historical judiciary in many countries. However, human rights concerns are becoming more and more relevant in trademark law.

***Keywords:*** *intellectual property, trademark, human rights, freedom of expression, privacy, property*

**Çingiz Nəsimi oğlu Çingizzadə**
Bakı Dövlət Universiteti
magistrant
cingizzadec@gmail.com

## Ticarət nişanları və insan hüquqları

**Xülasə**

İnsan hüquqları və ticarət nişanı qanunları bir-birinə uyğun gəlmir. Bu, qismən təhsil ənənəsinin və hüquqi tədqiqatların bir tərəfdən özəl və kommersiya hüququna, digər tərəfdən isə ictimai hüquqa, beynəlxalq hüquqa və insan hüquqlarına bölünməsinin nəticəsidir. Bu bölgü bir çox ölkələrdə tarixi məhkəmə sistemi tərəfindən də gücləndirilir. Bununla belə, əmtəə nişanı hüququnda insan hüquqları ilə bağlı narahatlıqlar getdikcə aktuallaşır.

***Açar sözlər:*** *əqli mülkiyyət, ticarət nişanı, insan hüquqları, ifadə azadlığı, şəxsi toxunulmazlıq, mülkiyyət*

## Introduction

### A. Protection of property

This aspect of human rights protection concerns the trademark holder as the property right holder. The scope of this ownership is determined by the primary function of the trademark. Property protection is usually found in national constitutions, but is not a typical feature of international human rights protection. Neither the International Covenant on Civil and Political Rights nor the International Covenant on Economic, Social and Cultural Rights contain provisions on the protection of property. The European Convention on Human Rights protects property not in its main part, but only through the First Protocol, which was added later. Article 1 of the First Protocol provides that every natural or legal person has the right to freely use their property, but the rule allows interference with this right, provided that the criterion of proportionality is met, which balances individual interests with the interests of society. Article 1 applies only to the existing property of a person and does not guarantee the right to acquire property. The meaning of the word "property" is not limited to tangible objects, but includes intangible property and rights such as planning permits, company shares, goodwill and patents. The relevant criteria for establishing "possession", "ownership" or "biens" are whether the right or interest has economic value and whether there is a legitimate expectation to obtain an effective exercise of that right (Əliyev, 2014: 25).

### B. Freedom of expression

The issue of reconciling trademark rights and freedom of expression is a classic issue discussed by European scholars, which has recently been reopened due to the explicit reference to "fundamental rights and freedoms, and in particular freedom of expression" in the preamble to Directive 2015/2436 and Ordinances 2017/1001. In this article, the author argues that, in the light of EU law, conflicts between freedom of expression and trademark rights are often illusory. Indeed, in this discussion we are too quickly focusing on the issue of resolving a potential conflict, while EU trademark law itself provides restrictions that guarantee respect for freedom of expression. It should also be borne in mind that commercial expressions enjoy more limited freedom because they serve private economic interests rather than the interests of society as a whole. Consequently, freedom of commercial expression should be limited to trademark rights, which are also fundamental rights of equal value. Therefore, it seems redundant to envisage the use of a designation that reproduces or imitates a trademark, associated with freedom of expression, as a specific limitation of trademark rights, either in a specialty or in the area of enhanced protection of trademarks with reputation.

The right to freedom of expression is a human right most likely to come into conflict with the use of a trademark. In addition to national constitutions, this right can be found, for example, in article 19 of the International Covenant on Civil and Political Rights (Əliyev, 2016: 13). At the European level, Article 10 of the European Convention on Human Rights ensures the right to liberty. Expressing opinions with a qualification that allows this right to be limited in accordance with the terms of Article 10 (Əliyev, 2014). In this context, two cases are important: firstly, when the trademark is used by the owner of the trademark, which may be contrary to public policy or public order, and, secondly, when the trademark is used against the owner of the trademark by someone else, or, at least without the consent of the trademark owner, usually or predominantly outside the trade, for the purpose of artistic expression, parody or criticism of the commercial practice of an enterprise associated with the trademark.

The first situation involves cases where a trademark applicant attempts to register a mark (sometimes successfully), which is potentially contrary to public policy or generally accepted moral principles. International and national trademark laws treat such reasons as absolute grounds for refusing registration. Refusal to register may run counter to the right to freedom of expression, since commercial appearances, such as in the form of advertising, are also "expressions of opinion" and, as such, are protected, but subject to the restrictions that apply to the right to freedom of expression. Generally (Grishaev, 2007: 66). According to the European Court of Human Rights, where advertising serves more than a purely commercial function and also serves the broader public interest, national authorities have a narrower margin of appreciation. However, in the context of trademark law, this area of concern does not seem to be of much practical importance and is rather limited to some bizarre edge cases. In Italy, for example, litigation arose over the fact that wines were sold with Hitler's label and Nazi slogans. In the UK, an application has been accepted to register FCUK as a (potentially offensive) trademark. In cases where a trademark is denied for reasons of public policy and morality, the UK authorities (courts and trademark registrar) usually give due consideration to freedom of expression when deciding on an application.

The second scenario is the use of the trademark by non-owners for parody, artistic purposes or for criticism. It was only in this situation that a significant number of court cases arose in several jurisdictions. In Germany, several cases of ridicule or criticism of advertising have been tried in the German Supreme Court. In the Marlborough / Mordoro case, the defendant used the Marlboro trademark in grotesquely modified form and context in a calendar that promoted the ban on smoking. The court ruled that, in principle, violation of trademark rights can be justified on the basis of freedom of expression: economic interests should be inferior to the fundamental human right to freedom of expression, but criticism should also be materially justified when compared with the rights of the owner of the trademark. economic interests (Sergeev, 2007: 98). In BMW, an anecdote seller used the trademark of a famous car manufacturer in stickers that invited sexual intercourse using words with the same BMW initials. The court ruled that the trademark rights had

not been infringed because the use in question was not a trademark use, and the defendant did not in fact resort to anti-competitive free use of the plaintiff's reputation (and did not demean it), but presented a vulgar joke that the public acknowledged such. Consequently, the court probably did not need to explicitly invoke freedom of expression. In the recent Lila-Postkarte case, the question of the potentially competitive nature of the use of a trademark was narrowly interpreted (because it was a well-known mark), but, in turn, particular attention was paid to human rights. The plaintiff produced and sold chocolate under the trademark MILKA with a distinctive lilac background and used lilac-colored cows in his advertising. The defendant, a postcard publisher, produced postcards of the same lilac color with text that satirically referred to two famous poets and a cow, and thus referred to the plaintiff's famous brand. The Supreme Court ruled that the use of lilac is a trademark, and marketing of the postcard is indeed taking advantage of the plaintiff's trademark reputation as the spoof is based on the fact that the public can associate it with a well-known brand. However, there is still no violation, since the defendant could have invoked the constitutional right to freedom of the arts (a specific version of freedom of expression). The postcard is a satirical artistic engagement with the applicant's trademark. Unless trademarks are used in a derogatory manner or in a purely commercial context, the right to art freedom prevails (Rahmatian, 2008: 57).

## C. Protection of privacy and reputation

While these rights are of great importance in copyright law, they do not have much meaning as stand-alone human rights in the context of trademarks. Problems that may arise here are usually fully resolved by remedies and protections in the trademark laws themselves (for example, protection against the use of one's own name or address, or the use of a mark solely for descriptive purposes), so that the rights to privacy and reputation are unlikely. Will be treated separately as a human right in a trademark infringement claim. Goodwill is in any case key to a brand or a claim. However, customary privacy rights may become relevant if someone's name resemblance has been registered as a trademark or without that person's permission (Geiger, 2007: 104).

## D. Right to self-determination/minority culture protection

In the context of intellectual property, attempts have been made to realize the right to self-determination and protect minority cultures by introducing a regime to protect the traditional cultural expressions of indigenous peoples. Such protection clauses, which broadly cover the scope of copyright (from a Western perspective), can be found in many national laws and internationally, but they can be very problematic as they can reinforce segregation policies with neo-colonial features. disguised as the protection of indigenous / minority cultures. Typically, traditional cultural protections can be found in copyright laws as “folklore” clauses, but trademark law has also been used to achieve these goals. New Zealand Trademark Act 2002 protects indigenous marks of the Maori community. In section 17 (1) (ii), the absolute grounds for refusing to register a trademark include prohibiting the registration of marks if their “use or registration would offend a significant part of society, including Maori”. Another method of protection could be a register in which designations (for example, traditional indigenous designations) can be entered, preventing such designations from being registered as trademarks (Sergeev, 2007: 77). Such "negative trademark registers" (Freizeichenrollen) existed in several German states in the first half of the 19th century. Thus, the mechanism for enforcing human rights can be partly provided by commercial law itself.

## F. Other relevant rights

A number of other human rights may be relevant in the context of trademarks, but generally these aspects of human rights are not specific to trademark rights. For example, the question of whether the right to a fair trial was violated in a trademark dispute was to be decided by the European Court of Human Rights in a recent case against Russia (7). The right to a fair trial can also be important, for example with regard to the redistribution of the burden of proof in the criminal offense provision of section 92 (5) of the UK Trademarks Act 1994 and its compatibility

with the presumption of innocence clause in section 6 (2) European Convention on Human Rights. Free use of trademarked materials for educational purposes and mention of trademarks and trade names in dictionaries or encyclopedias may also be subject to human rights protection. However, these questions tend to be of very limited relevance, at least for the time being (8).

## References

1. Əliyev, E. (2014). “Avropa əqli mülkiyyət hüququ”.
2. Əliyev, Ə. (2016). “İnsan hüquqları”.
3. Grishaev, S.P. (2007). Legal protection of trademarks.
4. Sergeev, A.P. (2007). Legal protection of trademarks.
5. Rahmatian, A. (2008). ‘Trade Marks and Human Rights’ in PLC Torremans, Intellectual Property and Human Rights.
6. Geiger, Ch. (2007). "Trade Marks and Freedom of Expression - The Proportionality of Criticism'.
7. http://www.injuria.az/news/genis-yayilmis-emtee-nisanlarinin-qorunmasi
8. https://www.pa.edu.az/library/3/21/155_movzu_11._beynelxalq_insan_huquqlari_hququ.pdf.

Received: 15.10.2021 Accepted: 18.12.2021

DOI: https://doi.org/10.36719/2706-6185/06/25-28

**Nərgiz Nazim qızı Əhlimanova**
Bakı Dövlət Universiteti
magistrant
nargizahlimanova@gmail.com

## STEAM – KİMYANIN TƏDRİSİNDƏ YENİ TƏLİM TEXNOLOGİYASI KİMİ

**Xülasə**

STEAM Education tələbə sorğusu, dialoq və tənqidi düşüncəni istiqamətləndirmək üçün giriş nöqtələri kimi Elm, Texnologiya, Mühəndislik, İncəsənət və Riyaziyyatdan istifadə edən öyrənmə yanaşmasıdır. STEAM dərslərinin tədris prosesində istifadəsi, tənqidi təfəkkürün artırılması, şagird nailiyyətlərinin yüksəldilməsi və şəxsiyyətin formalaşmasına kömək edir. Bu məqalə STEAM metodlarının üstünlüklərindən bəhs edir və STEAM əsaslı kimya dərsi modelinin nümunəsi olduğunu göstərir. İnkişaf etmiş ölkələrin təhsil təcrübələri göstərir ki, tədris prosesində bir-birilə yaxın olan elm sahələrinin sintezi, yəni fənlərarası inteqrasiya olunaraq tədrisi mükəmməl nəticələr əldə etməyə imkan verir.

***Açar sözlər:*** *STEAM təhsili, tənqidi düşüncə, təbiət elmləri, texnologiya, mühəndislik, kimyanın tədrisi, kimyəvi eksperiment*

**Nargiz Nazim Ahlimanova**
Baku State University
master student
nargizahlimanova@gmail.com

## STEAM - as a new learning technology in the teaching of chemistry

**Abstract**

STEAM Education is an approach to learning that uses Science, Technology, Engineering, the Arts and Mathematics as access points for guiding student inquiry, dialogue, and critical thinking. Use of STEAM lessons in teaching process, increased critical thinking, improved student achievement and help to development of personality formation. This article discusses the advantage of the STEAM methods and shown that an example of a STEAM-based chemistry lesson model. The educational experiences of developed countries show that the synthesis of the fields of science that are close to each other in the teaching process, that is, interdisciplinary integrated teaching, allows to achieve excellent results. Ch

***Keywords:*** *STEAM education, critical thinking, science, technology, engineering, teaching of chemistry,chemical experiment*

*"Təhsilin bütün məqsədi güzgüləri pəncərələrə çevirməkdir".*

***Sidney J. Harris***

### Giriş

Bu olduqca gözəl və mənalı bir cümlədir. Güzgünü pəncərəyə çevirmək dünyanı görmək üçün özümüzə baxmaq deməkdir. Güzgü bizə kim olduğumuzu göstərir. Ancaq bir pəncərə ilə biz bütün dünyanı görə bilərik. Dünyaya necə baxmağımız isə bizim düşüncələrimizdən asılıdır. Cinayətkar başqalarını pis görər, çünki özü də elədir. Dürüst bir insan isə ətrafındakı hamının özü kimi yaxşı olduğunu düşünər. Təhsilin qarşısında duran əsas məqsəd də insanları kamilləşdirmək, əhalinin savadlılıq faizini artırmaq, insanları gündən-günə dəyişən, inkişaf edən dünyanın tələblərinə uyğunlaşdırmaqdır. Zamanında doğru verilmiş təhsil, tərbiyə bütün pislikləri yaxşılıqlara,

savadsızlığı savadlılığa doğru dəyişdirməyin yeganə yoludur. Təhsil dünyanı dəyişdirmək üçün istifadə edə biləcəyimiz ən güclü silahdır.

İnkişaf etmiş ölkələrin təhsil təcrübələri göstərir ki, tədris prosesində bir-birilə yaxın olan elm sahələrinin sintezi, yəni fənlərarası inteqrasiya olunaraq tədrisi mükəmməl nəticələr əldə etməyə imkan verir. Çünki hər bir prosesin və hadisələrin inkişafının əsasını ziddiyyətlərin vəhdəti və mübarizəsi təşkil edir. Hər bir fənnin özünün öyrənmə dairəsi var və tədris fənnindəki inteqrasiya elmin məntiqinə uyğun gəlmək şərtilə bu dairədən kənara çıxmamalıdır.

Fənlərarası əlaqələrin öyrənilməsi bu gün də didaktikanın öyrəndiyi ən aktual məsələlərdən biridir (Pashayev, 1977: 107). Təbiət elmlərinin tədrisi zamanı fənlərarası inteqrasiyaya xüsusilə diqqət yetirilir.

Qabaqcıl müəllimlərin təcrübəsi göstərir ki, kimya dərsləri o zaman daha səmərəli və effektiv olur ki,öyrənilən kimyəvi maddələrin təsiri biologiya ilə, canlı təbiətə aid faktlarla bağlı olsun, baş verənkimyəvi proseslərin fizika ilə əlaqəsi öyrənilsin. Eynilə fizika dərslərində öyrənilən material ətraf mühitlə əlaqələndirilsin, şagirdlər öyrəndikləri biliklərə əsasən müxtəlif fiziki hadisələri dinamik şəkildə təsvir edən qurğular, modellər hazırlaya bilsinlər. Həmçinin də biologiya fənninin tədrisizamanı qeyd olunan qanunauyğunluqlar nəzərə alınsın, anlayışlara sadəcə bioloji yöndən yanaşılmasın.

Müəllim təlim prosesinin keyfiyyətini artırmaq məqsədilə hansı təlim metodundan istifadə etməsindən asılı olmayaraq, istər dərsin əvvəlində, istər təlim prosesinin ortasında, istərsə də sonda dərsi tamamlayarkən mütləq inteqrasiya məsələlərinə toxunmalıdır. Görkəmli rus pedaqoqu Uşinskinin də göstərdiyi kimi, müəllim bilikləri təkcə şagirdlərin şüuruna doğru deyil, həm də hislərinə doğru yönəltməyi bacarmalıdır. Təbii ki, bu yolda müəllimlərin köməyinə təlim-tərbiyə prosesində istifadə etdikləri dərs metodları, təhsil proqramları gəlir (Pashayev, 1977: 107).

Belə təhsil proqramlarından biri də son illər ərzində uğurlu inkişaf yolu keçmiş STEAM təlim metodudur. STEAM təhsilindən danışarkən deyirik ki, bu metod şagirdləri həyata hazırlayan layihə əsaslı bir təhsil kurikulumudur. Bu metodun tətbiqində əsas məqsəd şagirdlərdə kreativlik, kommunikasiya, kolloborasiya, tənqidi düşüncə kimi XXI əsr bacarıqlarını formalaşdırmaq, onlarda praktiki bacarıq və vərdişləri gücləndirmək, idraki təfəkkürlərini daha da inkişaf etdirməkdən ibarətdir. STEAM təhsili şagirdlərdən innovativ düşüncə tərzi tələb edir. Tədqiqatlar və təqdimatlar zamanı şagirdləri həm təşəbbüskar, həm də yaradıcı olmağa sövq edir (2).

Bəs STEAM təhsil metodu nə zaman və harada yaranmışdır? Qısaltmanın mənası nədir?

STEAM metodu ilk başlarda STEM kimi formalaşmışdır. Daha sonralar incəsənətin müxtəlif elm sahələrinə inteqrasiyası və əldə olunan səmərələrə əsaslanaraq STEM+A, yəni STEAM abbreviaturası yaradılmışdır. Qısaltmanın mənası isə ingiliscə science (elm), technology (texnologiya), engineering (mühəndislik), art (incəsənət), mathematics (riyaziyyat) sözlərinin baş hərflərini əks etdirir. Yəni STEAM təlim metodu xüsusilə kimya, fizika, biologiya kimi təbiət elmlərinin qeyd olunan elm sahələri ilə qarşılıqlı inteqrasiyasına əsaslanan, şagirdlərin praktikada bilavasitə özləri tətbiq edərək elmi biliklərə yiyələndiyi bir proqramdır.

STEM və STEAM-in tarixləri bir-birinə bağlıdır və onları birlikdə müzakirə etmək daha məqsədəuyğundur. Belə ki STEAM təhsil metodu keçən əsrin sonlarında Amerikada yaranmışdır və ilk olaraq amerika məktəblərində təcrübədən keçirilmişdir. Bir təlim texnologiyası kimi bizim təbiət elmləri (Həyat bilgisi) adlandırdığımız “science” elminin fonunda təşəkkül tapmışdır. Amerikada “science” elmi isə 1957-ci ildə SSRİ-nin ilk dəfə kosmosa peyk göndərməsindən sonra yaradılmışdır (Abishov, Jafarov, Ahlimanova, 2021: 24-29).

Yuxarıda da qeyd etdiyimiz kimi təbiət elmlərindən biri olan kimyanın tədrisi zamanı STEAM təhsil metodundan uğurla istifadə olunur və yüksək nəticələr əldə etməyə imkan yaradır. Kimya elə bir elm sahəsidir ki, nəzəriyyə ilə praktikanın vəhdətini tələb edir. Öyrənilən nəzəri-elmi biliklər STEAM əsaslı dərslərlə praktikaya tətbiq olunarkən şagirdlərin həm texnoloji, həm mühəndislik bacarıqları inkişaf edir. Tədris zamanı fizika, biologiya, riyaziyyat kimi elm sahələri ilə inteqrasiya yaradılır ki, bu da həm kimya fənnində, həm də qeyd olunan orta məktəb fənlərində şagirdlərin müzakirə olunan mövzu üzrə bilik, bacarıq və vərdişlərinin daha da dərinləşməsinə yol açır.

İndi isə kimya fənnindən STEAM əsaslı bir dərs modelinə baxaq (4):

8-ci siniflərə "Qeyri-üzvi birləşmələrin mühüm sinifləri" və ya "Duzların hidrolizi" mövzusu tədris olunan zaman kimyanın həyatla əlaqələndirilməsi prinsipini əsas tutaraq, içkilərdə turşuluğun ölçülməsi, gündəlik istifadə etdiyimiz qidalarda turşuluğun müəyyən olunması kimi tapşırıqlar vermək və STEAM əsaslı dərslər qurmaq olar. İnteqrasiyanı isə çox maraqlı bir şəkildə biologiya fənni ilə əlaqələndirmək olar. Müəllim əvvəclədən şagirdlərə insan sağlamlığına (həzm sistemi orqanlarına) turşuluğun təsiri mövzusunda araşdırma etməyi də tapşıra bilər. Ümumiyyətlə, şagirdlərin bu cür araşdırmalara cəlb olunması onları təhsil prosesinə həvəsləndirir, motivasiya verir və şagirdləri tədqiqatçı ruhunda yetişdirir. Həm də şagirdlərin bu yolla əldə etdikləri biliklər onların yaddaşında daha uzun müddət qalır (5).

Belə ki adı çəkilən mövzuların, xüsusilə də "Duzların hidrolizi" mövzusunda müəllim əsasi, turş və ya neytral mühiti izah edərkən, uyğun olaraq pH-ın müqayisəli qiymətindən istifadə edir. Kimya dili ilə desək:

- pH<7 – turş mühit,
- pH=7 – neytral mühit,
- pH>7 – qələvi və ya əsasi mühit.

Bu ifadələrdən sonra şagirdlər mütləq ki pH-ın nə olduğu haqqında maraqlanacaqlar, çünki bu onlara yad bir anlayışdır. pH-ın nə olduğunu, onun mahiyyətini müəyyənləşdirmək üçün müəllim şagirdlərə ideya verməyi və həmin ideya əsasında tədqiqat aparmağı tələb edir (6).

1) İnsanların müntəzəm olaraq istehlak etdikləri bəzi məşhur içkilərin adını çəkə bilərsinizmi? Onları turşuluq dərəcələrinə görə təşkil etməyə çalışın.
2) Həddən artıq turşulu qidaların, içkilərin qəbulu sağlamlığımıza nə kimi ziyanlar vurur?

Bundan sonra gündəlik istifadə etdiyimiz bəzi içkilər, məsələn su, limonad, kola kimi içkilərdə turşuluğun təyin olunması qarşıya məqsəd qoyulur.

**Dərsin mövzusu:** *İçkilərin pH (turşuluq) səviyyəsinin müəyyən olunması.*

**Təchizat:** "Labdisk biochem" laboratoriya qurğusu, pH sensoru, komputer, stəkan, su, limonad, kola.

**Vaxt tələbi:** bir dərs müddəti (45 dəq).

Tədqiqat fəaliyyəti zamanı tələbələr Labdisk qurğusundan və pH sensorundan istifadə edərək müxtəlif növ içkilərin turşuluğunu ölçürlər. Nəticələri komputerdə qeyd edirlər. Daha sonra isə ölçmələrdən alınan pH qiymətlərini kiçikdən böyüyə doğru sıralayıb cədvəl qururlar (7).

Şagirdlər yüksək turşuluğa malik olan maddələrin həddindən artıq istehlakını insanların yaşadıqları fiziki simptomlarla əlaqələndirirlər. Vücudumuzun daxilində müəyyən bir turşu-əsas tarazlığı mövcuddur ki, bunu qorumaq vacibdir. Çünki vücudumuzda təməl rol oynayan bir çox metabolik reaksiyalar yalnız dəqiq turşu və ya əsasi səviyyələrində ola bilər. Məhlulun pH-dakı kiçik bir dəyişiklik metabolizmanın asılı olduğu vacib kimyəvi reaksiyaların sürətinə təsir edə bilər,bununla da bədənimizdə baş verən təbii prosesləri riskə atmış olarıq. Məsələn, məşq əsnasında süd turşusu əmələ gəldiyi üçün əzələlərin turşuluğu yüksəlir. Bu ağrıya və könüllü əzələ büzülməsinin azalmasına səbəb olur.

## Nəticə

Təbiət fənlərindən olan kimyanın müasir tələblər səviyyəsində tədrisi mühüm vəzifələrdən biri kimi qarşıda durur. Kimya fənni üzrə STEAM kurikulumunun tətbiqi təlimin yeni keyfiyyət səviyyəsinə yüksəldilməsinə imkan yaradır. Kimyanın tədrisi zamanı şagirdlərə bu elmə maraq, riyazi hesablamalar, yeni texniki vasitələrdən istifadə etmək, təbiətdə baş verən hadisələri, maddi aləmdə gedən dəyişiklikləri dərk etmək, həyatda, məişətdə ekoloji problemlərin həllində iştirak etmək bacarığı aşılayır (8).

## Ədəbiyyat

1. Pashayev, P. (1977). Related study of natural sciences. Baku, "Maarif", 107 pages.
2. http://www.pullmanacademic.com.au/PDF/Labdisc/Labdisc_Middle_High_Schools_Curriculum_ Samples/Labdisc_MS_HS_How_Acidic_are_the_Things_we_Drink_Activity.pdf
3. Abishov, N.A., Jafarov, Y.I., Ahlimanova, N.N. (2021). Application of educational

STEAMmethodology in teaching chemistry. Journal of Chemistry at school, №1, 24-29 p.
4. https://muallim.edu.az/news.php?id=17701
5. http://anl.az/el/Kitab/Azf-269214.pdf.
6. http://www.tehsil.nmr.az/home/2023-thsild-yeni-metod-steam.html
7. https://genderi.org/x-sinifde-kimyanin-yeni-telim-texnologiyalari-ile-tedrisine-da.html
8. https://azkurs.org/yeni-telim-metodlari-esasinda-kimyanin-tedrisi-tecrubesinden-m.html

Göndərildi: 13.09.2021 Qəbul edildi: 08.11.2021

# İÇİNDƏKİLƏR

**Südabə Nəsrəddin qızı İsgəndərova**
Autizm spektr pozulması (ASP) olan uşaqların təlimində istifadə edilən metod və yanaşmalar....................5
**Elcan Elman oğlu Həsənli**
İdmanla əlaqəli mübahisələrinin anlayışı, mahiyyəti və həllinin hüquqi üsulları....................9
**Nubar Yahyabala qızı Bağıyeva**
Xalçaçı rəssam Məmmədhüseyn Hüseynovun xalça kompozisiyaları....................16
**Chingiz Nasimi Chingizzadeh**
Human rights relevant to trademarks....................21
**Nərgiz Nazim qızı Əhlimanova**
Steam – kimyanin tədrisində yeni təlim texnologiyasi kimi....................25

Çapa imzalanmışdır: 27.12.2021
Kağız formatı: 60/84, 1/8
H/n həcmi: 4 ç.v.
Sifariş: 460

https://aem.az saytında çap olunub.
Ünvan: Bakı şəh., Mətbuat prospekti, 529-cu məh.
Tel.: +994 50 209 59 68
+994 55 209 59 68
+994 12 510 63 99
e-mail: info@aem.az